İLYAS TAPDIQ    OQTAY HÜSEYNLİ

# SİNİFDƏNXARİC OXU

## 1-4



TURAN

İLYAS TAPDIQ OQTAY HÜSEYNLİ

# SİNİFDƏNXARİC OXU

*(Birinci, ikinci, üçüncü və dördüncü siniflər üçün)*

Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən çap olunması məqsədəuyğun sayılmışdır.





«TURAN» NƏŞRLƏR EVİ

Bakı - 2003

Baş redaktoru

Əjdər Ağayev,

*pedaqoji elmlər doktoru, əməkdar müəllim, professor*

Redaksiya heyəti

Azad Nəbiyev, *MEA-nın müxbir üzvü, əməkdar müəllim*

Qara Namazov, *filologiya elmləri doktoru, professor*

Qara Mustafayev, *biologiya elmləri doktoru, professor*

Vaqif Sultanlı, *filologiya elmləri doktoru, professor*

Əli Səmədli, *yazıçı, AYB Uşaq bölməsinin rəhbəri*

Bayram Ələsgərov, *coğrafiya elmləri doktoru*

Rəssamı

Rəsul Hüseynov

Bu kitaba daxil edilmiş şerlər və hekayələr, folklor nümunələri məktəblilərin dünya görüşünün formalaşmasında, biliyinin zənginləşməsində faydalı olacaqdır.

Həmçinin məktəblilər Vətənimizin gözəlliyindən, qəhrəmanlarımızın şücaətindən bəhs edən bir çox maraqlı yazılarla tanış olacaqlar.

T $\frac{4306020200}{113\text{-}2003}$ 01





# DOĞMA MƏKTƏB QOYNUNDA



## MƏKTƏB

Öz doğma evi kimi
Hər insana doğmasan.
Ucaltmayıb de kimi
Sənin quruca masan?!

Qoynunda hər səhərin
Təzə yaz nəfəsi var.
Əziz müəllimlərin
Ürəyinin səsi var.

Gələcəyin yolları
Pillələrindən keçir.
Ömrün gənclik qatarı
Şən illərindən keçir.

Təməlini qoyursan
Sabahkı xoş əməlin.
Ömrümüzün nurusan –
Heç azalmır şəfəqin.

Sənə könül verənin
Açılır gözü, məktəb.
Ən şirin xatirənin
Ən şirin sözü – məktəb!

*İlyas Tapdıq*



## XOŞBƏXTLİK

Təzə mənzilə köçmüşdük. Mənzilimiz yeni qəsəbənin mərkəzində idi.

Doqquzmərtəbəli, uca, uzun eyvanlı bir bina...

Binamızın yanında təzəcə tikilmiş məktəb var idi. Məktəb elə qəşəng görünürdü ki! Sevincimin həddi-hüdudu yox idi. Axı bu ildən həmin məktəbdə oxuyacaqdım.

Bir dəfə həyətə getmək üçün anamdan icazə aldım. Lift bizim mərtəbədə dayananda qapılar açıldı, içəri girdim.

Düyməni basdım. Lift altıncı mərtəbədə dayandı. Qapılar açılan kimi mən yaşda bir qız gülə-gülə özünü içəri saldı. Yenə düyməni basdım. Lift aşağı enməyə başladı. Qız maraqla soruşdu:

– Neçənci mərtəbədə olursan?

– Doqquzuncuda.

– Mənim ordan xoşum gəlir. Yəqin bütün şəhər görünür, elə? Sən neçəncidə oxuyursan?

– Üçüncüdə.

– Nə yaxşı! Mən də üçdə oxuyuram.

Lift dayandı. Hər ikimiz həyətə çıxdıq. Qız əlini məktəbə sarı uzatdı:

– Bax, bu da bizim məktəbimiz. Gedib baxmısan?

– Yox.

– Gəl, gedək baxaq.

Mən onunla birlikdə məktəb binasına sarı yollandım. Bizim həyətdən düz məktəbəcən asfalt yol uzanırdı. Yəqin ki, bu yolu bizim üçün çəkmişdilər.

Qız birdən dayandı:

– Bu yolun yanlarında ağac əkilsəydi, qəşəng görünərdi.

Nədənsə dinmədim. Qız üzümə baxdı:

– Yoxsa istəmirsən ki, yolun kənarlarında ağac olsun?

– Niyə istəmirəm? Şitil olsaydı əkərdik. Qəsəbəmiz daha gözəl, daha yaraşıqlı olardı. Harada yaşıllıq varsa, orada yaşayanlar sağlam olurlar, – dedim.

Təzə məktəbimizin pəncərələri böyük və işıqlı idi, geniş həyəti vardı. Həyətdə bir neçə meydança görünürdü. Qız hər tərəfi heyranlıqla süzdüyümü görüb soruşdu:

– Xoşuna gəlir?

– Bəli.

Bir neçə gün sonra hamımız işləyirdik. Ata-analarımıza kömək edir, yolun ətrafına şitillər basdırırdıq. Həsrətlə yeni dərs ilinin başlanmasını, məktəbin ilk zənginin səslənməsini gözləyirdik.

*Alxas Alxasov*



**ZƏHRA ÜÇÜN**

İrəli qoş, irəli,
Ey mənim gözəl qızım.
Qalma həyatdan geri,
Oxu mükəmməl, qızım.

Uca dağlardan atlan,
Hər çətinliyə qatlan,
Bir quş kimi qanadlan,
Göylərə yüksəl, qızım!

Mehriban ol insana,
Bir yuxarı baxsana!
Göydə günəş, ay sana
Eləyir "gəl, gəl", qızım!

*Mikayıl Müşfiq*





**QONŞULAR**

Qoca dələ tək-tənha yaşayırdı. Bir dəfə o, səfərə getmiş oğlundan məktub aldı. Dələ savadsız idi. Ağacdələni tapıb məktubu ona oxutmaq istədi. Yolda dovşana rast gəldi. Dələ dedi:

– Sənə qurban olum, ay dovşan. Bunu oxu, görüm oğlum nə yazır?

Dovşan məktubu alıb, o üz-bu üzünə baxdı. Uzun qulaqlarını sallayıb ağlamağa başladı. Dələ qorxuya düşdü. Soruşdu:

– De görüm, sənə nə oldu?

Dovşan əlləri ilə üzünü örtüb, daha da bərkdən ağladı. Dələ elə bildi ki, oğlunun başında bir qəza var. O da dovşana qoşulub ağlamağa başladı. Yoldan cırcırama keçirdi. O, dələ ilə dovşana yanaşdı. Heç bir şey soruşmadan ağlamağa başladı.

Kol dibində büzüşüb yatmış kirpi də səsə oyandı. Dələnin, dovşanın, cırcıramanın ağladığını görüb mat qaldı: "Görəsən bunlara nə olub, belə hönkürürlər?" Yaxınlaşdı, cırcıramadan soruşdu:

– Niyə ağlayırsan?

Cırcırama dedi:

– Üç ay yayı oxuyub-oynamışam, ayaqlarımın altı qabar olub. Ağlamayım, neyləyim?

Kirpi dələdən soruşdu:

– Ay dələ, bəs sən niyə ağlayırsan?

Dələ dedi:

– Dovşan oğlumun məktubunu oxudu, ağlamağa başladı, dedim yəqin oğlumun başında bədbəxtlik var. Ona görə ağlayıram.

Sonra kirpi dovşandan soruşdu:

– Bəs sən niyə ağlayırsan?

Dovşan hönkürə-hönkürə dedi:

– Kirpi qardaş, mən məktubu oxuya bilmədiyim üçün ağlayıram. Uşaqlıqda tənbəllik eləmişəm, dərs oxumamışam. Xəcalətimdən dələnin üzünə baxa bilmirəm.

Kirpi məktubu dovşandan aldı. Ucadan oxudu. Dələnin oğlu yazırdı ki, sağ-salamatlıqdır. Anası üçün darıxır. Bu yaxınlarda səfərdən evə qayıdacaq.

*Tofiq İsmayılov*

## VALİDEYNLƏRƏ

Övlad – xoşbəxtlik rəmzi,
Övlad – şirin arzudur.
Uşaq üçün itən vaxt
Sabahın qayğısıdır.

Əziz ata-analar,
Əziz valideynlər,
Sonradan əzab olur
Bəhrəsiz ötsə günlər...




Hər gün təzə kitabla
Sevindirin uşağı.
Kitab tutan əllərin
Sönməz olur çırağı!

*İlyas Tapdıq*



## GÖY YARPAQLAR

Katyanın iki yaşıl qələmi vardı. Lenada isə bircəciyi də yoxdu. Buna görə də Lena Katyaya dedi:

– Yaşıl qələmini ver mənə.

Katya isə dedi:

– Qoy anamdan soruşum, sonra verim.

Ertəsi gün qızlar məktəbə gəldilər.

– Anan icazə verdimi? – deyə Lena soruşdu.

– Anam icazə verdi. Ancaq qardaşımdan soruşa bilmədim, – deyə Katya ah çəkdi.

Lena dedi:

– Nə olar, qardaşından da icazə al.

Səhərisi Katya gəldi. Lena soruşdu:

– Nə oldu, qardaşın razı oldumu?

– Razı oldu, ancaq qorxuram ki, ucunu sındırasan.

– Lap yavaşca çəkərəm, – deyə Lena cavab verdi.

– Bax, ucunu çərtmə ha, bərk basma, ağzına vurma. Özünü də çox işlətmə.

– Mən ancaq ağacların yarpaqlarını, bir də yaşıl otları rəngləyəcəyəm.

– Bu, lap çoxdur, – deyib Katya qaşqabağını tökdü. Onun üzündə narazı bir ifadə vardı.

Lena baxdı, sonra dönüb getdi. Qələmi almadı. Katya təəccüb etdi. Onun dalınca qaçaraq:

– Sənə nə oldu? Al da! – dedi.

- Lazım deyil! – deyə Lena cavab verdi.

Dərs zamanı müəllim soruşdu:

– Lenoçka, bəs sənin ağacının yarpaqları niyə göydür?

– Yaşıl qələmim yoxdur.

– Bəs nə üçün öz yoldaşından almadın?

Lena dinmədi. Katya xərçəng kimi qızardı:

– Mən verirdim, o özü almadı, – deyə dilləndi.

Müəllim hər ikisinə baxıb dedi:

– Gərək elə verəsən ki, alsın.

*Valentina Oseyeva*



## ATA VƏ OĞUL

Ay dədə, dur get mənə çox şeylər al!
Bir dənə çanta, bir-iki dəftər al!
Mən dayım oğluyla gəlirdim bayaq,
Gördüm o məktəbdə oxur çox uşaq.
Durdum ora pəncərədən baxmağa,
Dərslərinə azca qulaq asmağa.
Dərsləri yetdikdə, dədə, axirə,
Oxudular elliyi birdən-birə.
Hamısının yaxşı tuturdu səsi,
Hər kim ola görsə düşər həvəsi.
Çöldə məni gördü müəllimləri,
Tutdu apardı özü lap içəri.
Xeyli danışdırdı məni, dinlədi,
Sonra nəvazişlə mənə söylədi:
– De, səni göndərsin atan məktəbə,
Elm oxuyub ta yetəsən mətləbə.

*Abbas Səhhət*



## NƏNƏM MƏKTƏBLİDİR

Solmaz atası ilə gəzməkdən gəlirdi. Onun əlində bir dəstə çəhrayı qərənfil vardı. Həyətdə Nailəni görüb dedi:

– Bilirsən, nə var? Bu gün nənəm təqaüdə çıxıb. Bu qərənfilləri ona hədiyyə almışıq. Yaxşıdır?

Nailə dedi:

– Yaxşıdır. Bəyəm sənin də nənən məktəbli olacaq?

Solmaz təəccübləndi. Dodağını büzüb dedi:

– Heç nənə də məktəbli olar?

– Niyə olmur, mənim nənəm məktəblidir. İnanmırsan, gəl gedək, nənəmin dəftər-kitabını sənə göstərim.

Qızlar qaça-qaça Nailəgilə getdilər. Nailə yataq otağına keçdi. Kiçik, qara bir çanta gətirdi. Solmaz maraqla çantaya baxıb soruşdu:

– Bu nənənin məktəb çantasıdır?

– Susss... Yavaş. Tikiş maşınının səsini eşidirsən?! Nənəm orada dərsini hazırlayır.

Qızlar üsulluca çantanı açdılar. İçindəkiləri stolun üstünə boşaltdılar. Solmaz maraqla şəkilli kitaba, cizgilər çəkilmiş hərflərə, rəqəmlər yazılmış dəftərə baxdı. Nə qədər çalışdısa da yazıları oxuya bilmədi. Nailə isə hey Solmazı dümsükləyir, pıçıltı ilə deyirdi:

– Oxu da. Oxu, görək nənəm nə yazıb?

Solmaz çiyinlərini qısıb dedi:

– Axı biz hərflərin hamısını öyrənməmişik...

Nailənin gözü üçbucaq xətkeşə sataşdı.

– Aa... nənəmin xətkeşi var ki... – deyib ucadan güldü.

Səs-küyü eşidən nənə, mətbəxdən qızları səslədi:

– Ay dəcəllər, orda nə edirsiniz?

Qızlar susdular. Tez dəftər-kitabı və xətkeşi çantaya qoydular. Elə bu vaxt nənə qızların yanına gəldi. Çantasını Nailənin əlində görüb dedi:

– İndi də çantama əl atmısan?

Solmaz nənəyə baxıb bərkdən güldü, yerində atılıb-

düşdü. Sonra qışqırdı:

– Nailə, nənən doğrudan da məktəblidir...

Nənə qızları qucaqladı:

– Bəs necə? Adam gərək həmişə oxusun, öyrənsin...

– Siz ki müəllimsiniz. Bəs təzədən məktəbə niyə gedirsiniz?

– İndi də dərzilik öyrənirəm. Sizə gözəl-gözəl paltarlar tikəcəyəm.

– Sizə də deyiblər ki, dərsə gələndə məktəbli kimi geyinin?

– Yox, qızım. Nə üçün soruşursan?

– Bəs onda niyə belə geyinmisiniz?

Nənə aynada diqqətlə özünə baxdı. Onu gülmək tutdu. Əynində ağ yaxalıqlı, qəhvəyi yun paltar var idi. O, bu paltarda doğrudan da məktəbliyə oxşayırdı.

*Xalidə Hasilova*



## ÇİNAR VƏ GİLƏNAR

Keçən ilki bu çinar
Gör necə boy atıbdı.
Üçüncülər oxuyan
Mərtəbəyə çatıbdı.

Hamı deyib-gülür ki,
Üçə keçibdi çinar.
İkincidə qalıbdı
Ancaq hələ gilənar.

*Əli Kərim*



## MEŞƏSALANLAR

Babamgilin evi meşəyə yaxın idi. Səhər tezdən yuxudan durub həyətə çıxanda səhərin ilıq şüaları gözümü qamaşdırırdı. Günəşin şəfəqi yaşıl yarpaqların üstünə düşdükcə par-par parıldayırdı.

Lap aşağılardan – aran tərəfdən ağ örpəyə bənzəyən bir dəstə duman dağlara doğru qalxırdı. Mənə elə gəlirdi ki, nağıl dünyasına düşmüşəm. Dörd yanımız meşə, uca dağlar, evin aşağısından şırıltı ilə axıb gedən dağ çayı...

Babam meşədən gələndə ciblərində qulançar, quzuqulağı, yemlik gətirirdi. Nənəm səhər-axşam inəkləri, qoyunları sağandan sonra südü bişirər, qaymağını mənə yedirərdi. Qaymaq elə dadlı olur ki!

Bir səhər babam mənə dedi:

– Oğlum, meşəyə gedirəm, gəl səni də aparım. Gör, babanın necə gözəl meşəsi var! Hələ bu gördüklərin əsl meşə deyil.

Sevindim. Babam bel, balta götürdü. Boz ürgəyə minib nənəmi səslədi:

– Ay arvad, Qoşqar balanı ver qucağıma.

Ömrümdə heç ata minməmişdim. Atı kinolarda, sirklərdə görmüşdüm. Nənəm məni götürüb babamın qucağına – yəhərin qaşına qoydu. Kənddən çıxıb meşə yoluna düşdük. Yol bizi meşənin dərinliyinə apardı. Gözəl bir talada atdan düşdük.

Babam sıx ağaclığı göstərib dedi:

– Qoşqar bala, bu şitillərdən çıxardıb aparacağıq.

– Hara aparacağıq, baba?

Babam alnından süzülən təri sildi:

– Burada sıxlıqdı. Şitillərdən çıxarıb bir düzənlik var, ora aparacağıq. Orada cavan meşə salırıq.

Babam cavan şitillərdən xeyli çıxarıb qom bağladı. Ata mindi, əlimdən tutub məni də qucağına aldı. Sonra ağaca söykədiyi şitil qomunu götürdü.

Düzənliyə çatdıq. Burada xeyli adam ağac əkirdi.

Atdan düşdük. Babam şitilləri açıb oradakılara payladı.

Adamlar ağac basdırmaq üçün balaca çalalar qazırdılar. Mən şitilləri bir-bir bu çalalara qoyurdum. Babam da onların diblərini torpaqlayırdı.

– Baba, – deyə soruşdum, – meşədə də ağac əkərlər?

Babam güldü:

– Bəs necə? Bu gördüyün meşənin yarısını əlimizlə salmışıq. Elə yerlər var ki, orada ağac sıx-sıx bitib, elə yer də var ki, heç ağac yoxdur. Süni meşə salırıq ki, meşələri qoruyaq. Oğlum, meşə bizim sərvətimizdir. Küləyin, tufanın, sel-suyun qarşısını kəsən də meşədi, yayın qızmarında kəndimizə sərinlik verən də. Havanı təmizləyən də meşədi, gözəlliyi ilə bizi heyran qoyan da.

Təzə basdırılmış şitillərə baxdıqca fərəhlənirdim. Axı bir vaxt bu balaca şitillər böyüyüb qol-budaqlı ağaclar olacaq, burada quşlar səs-səsə verəcəklər...

Mən də bir zamanlar buraya gəlib saldığımız meşəni görüb fərəhlənəcəyəm.

Bəs necə? Axı burada mənim də zəhmətim var.

Dünyada ən şirin şey zəhmətdir. Babam deyir ki, zəhməti sevənin ağzı bal dadar...

*Alxas Alxasov*

### DƏYƏRLİ MƏSLƏHƏT

Yediyimiz qida ifraz olunan mədə şirəsi vasitəsilə həzm olunur. Elm müəyyən etmişdir ki, yemək zamanı adamın diqqəti hər hansı kənar bir şeylə məşğul olduqda mədə şirəsinin ifrazı azalır, qidanın həzmi pisləşir. Buna görə də yemək zamanı kitab oxumaq məsləhət görülmür. Çünki oxumaqla məşğul olarkən qida ağızda lazım olduğu qədər çeynənmir, az islanır. Bu da qidanın həzminin ləngiməsinə səbəb olur.

Nəhayət, yemək zamanı oxumaq bir də ona görə məsləhət görülmür ki, kitab çirklənə bilər. Gərək özünü kitaba qayğıkeş münasibət bəsləməyə alışdırasan. Axı kitabı başqaları üçün də qoruyub saxlamaq lazımdır.





# VƏTƏNİM



## AZƏRBAYCAN – YURDUM MƏNİM

Qayalarda bitən çiçək,
Çiçəklikdə bir qayatək,
Ulduzlara səs düşəcək:
Azərbaycan, yurdum mənim!

Qartalları od qanadlı,
Oğulları şimşək atlı,
Ana Vətən – kainatdı
Azərbaycan, yurdum mənim!

Dostdan uca zirvə varmı?
Sözdən şirin meyvə varmı?
Bundan gözəl töhfə varmı –
Azərbaycan, yurdum mənim!

*Məmməd Araz*



## VƏTƏN NƏDİR?

Elşən gülərüz, mehriban bir uşaqdı. Ata-anası işə gedəndə Elşən axşamacan babasının yanında qalırdı. Buna görə də babasına elə isinişmişdi ki, gündüzlər ata-anası heç yadına düşmürdü. Həsən baba da Elşəndən ayrılanda darıxırdı. Hətta bəzən kövrəlirdi də.

Elşənin ata-anası işə gedəndən sonra Həsən baba nəvəsinin əlindən tutub gedirdi şəhərin ən yaxşı bağlarından birinə. Baba taxta oturacağın üstündə əyləşib özü kimi qocalarla söhbətə başlayırdı. Olub keçənlərdən danışırdı. Ötən günləri yada salırdı. Elşən isə bağdakı uşaqlara qoşulub oynayırdı.

Bir gün yenə Həsən baba nəvəsini həmin bağa aparmışdı. Günortadan gun əyilənə qədər Həsən baba öz taytuşu ilə şirin söhbət elədi. Nəvəsi də uşaqlarla oynadı. Gün əyiləndən sonra qocalar durub Həsən babayla sağollaşdılar və nəvələrini götürüb evlərinə getdilər. Elşən qaça-qaça babasının yanına gəldi. Oturacağın üstünə çıxıb ayaqüstə dayandı. Babası boyda oldu. Başını babasının başına söykəyib soruşdu:

– Baba, ay baba, vətən nədir?

Həsən baba nəvəsinin üzünə baxdı. Bu sözün onun ağlına hardan gəldiyini, niyə gəldiyini düşündü.

– Vətən nədir?

– Hə, baba, vətən nədir?

– Bu sözü hardan eşitmisən, kim deyib sənə?

– Ordakı uşaqlar danışırdılar. Məktəblilər. Deyirdilər ki, vətən müqəddəsdir. Heç nə başa düşmədim. Vətən nə olan şeydi?

Həsən baba fikrə getdi. Necə eləsin ki, bu sözü Elşənə başa sala bilsin. Axı nəvəsi bu sözün mənasını hələ dərk edə bilməz. "Vətən" sözünü eşitsə də, vətənin nə olduğunu bilmir. Həsən baba çox fikirləşdi, fikirləşdi, axırda dedi:

– Elşən, bizim evimiz var?

– Hə, baba, var.

– Evimizi nəyin üstə tikiblər?



– Torpağın üstə, baba.

– Ay sağ ol, o torpaq vətən torpağı adlanır. Gördüyün bu evlərin hamısı vətən torpağı üstə tikilib. Deməli, yaşadığımız bu şəhərdə nə varsa hamısı vətən torpağındadır. İndi oturduğumuz bağ da vətən torpağında salınıb.

– Baba, onda bu şəhər bizim vətənimizdir?

– Oğlum, yaşadığımız bu şəhər bizim vətənimizin bir hissəsidir. Axı vətənimiz böyükdür. Onun çoxlu şəhərləri, kəndləri var. Çölləri, düzləri, bağları, meşələri, dağları, əkin sahələri, biçənəkləri var.

Babasının danışdıqları Elşənə nağıl kimi gəlirdi. Axı o, heç vaxt belə şeylər eşitməmişdi. Bir az fikrə gedəndən sonra soruşdu:

– Baba, ay baba, çöldən də, meşədən də vətən olar?

– Niyə olmur, oğlum?

– Axı çöldə, meşədə adam yaşamır. Adam yaşamayan yer də heç vətən olarmı? Axı sən bayaq dedin ki, biz yaşadığımız yer vətəndir.

– Dedim, düzdür. Bax, o çöllərimiz, meşələrimiz, bağlarımız, əkin sahələrimiz olmasa, biz nə yeyib yaşayarıq? Hər kəndin sahəsi var. Əkir, becərir, məhsulunu yığıb özləri də yeyirlər, şəhərlərə də göndərirlər. Adını çəkdiklərimin hamısı birlikdə vətən sayılır. Bizim vətənimiz isə Azərbaycandır.

Babasının söhbəti Elşəni sehrləmişdi. Çox sözü anlaya bilmirdi, bir-birinə qarışdırırdı.

– Baba, onda biz də vətənin bir hissəsiyik?

– Əlbəttə, oğlum.

– Onda bizə də vətən demək olar?

Nəvəsinin sözünə Həsən baba güldü:

– Bizə vətən yox, vətəndaş demək olar, oğlum.

– Baba, bəs vətəndaş nədir?

– Bu çox böyük sözdür, oğlum, vətəndaş bu vətənin sahibinə, ona cavabdeh olan adamlara deyirlər. Vətəndə yaşayıb onu sevən, qoruyan, ona qayğı göstərən, həyatını onun yolunda qurban verməyə hazır olan adamlara vətəndaş deyirlər. Heyf ki, xalqımızın içində elələri var ki, bu torpağın naz-nemәti ilə böyüsələr də, əsl vətəndaş deyillər. Yəni bu vətənə yanmırlar. Belələrinə vətəndaş demək olmaz.



– Baba, bayaq "xalq" dedin.

– Bəli, dedim, oğlum.

– Bəs xalq nədi?

– Sən, mən, atan, anan, bacın, qardaşın. Bütün vətəndaşlara birlikdə xalq deyirlər. Bax, azərbaycanlıların hamısı birlikdə Azərbaycan xalqı adlanır. Hər xalqın da öz vətəni, öz dili olur. Vətəni olan xalq hər şeyi yarada bilir. Buna görə də vətənə ana deyirlər, onu müqəddəs sayırlar.

– Baba, bəs müqəddəs nə deməkdir?

– Ən əziz, toxunulmaz şey müqəddəsdir. Onu nə satmaq, nə almaq, nə də başqasına bağışlamaq olar.

Elşənlə babasının söhbəti çox uzanmışdı. Günəşin batmasına az qalırdı. Həsən baba nəvəsinin əlindən tutub bağdan çıxdı...

*Qaçay Köçərli*

## KÜR BOYUNDA

Kür çayı xəyaldadır
İlin yaz-yay ayında.
Gör, neçə nəğmə yatır
Səsində, harayında.
El onun nəğməsilə
Oyanar Kür boyunda.

Üfüqlər tül geyinər,
Bağçalar gül geyinər,
Gözəllər al geyinər
Kür üstünün toyunda,
Ulduzlar tamaşaya
Dayanar Kür boyunda.

Aylar ilə qovuşar,
Sellər selə qovuşar.
Muğan Milə qovuşar
Mehriban Kür çayında.
Dünya günəş rənginə
Boyanar Kür boyunda.

*Gəray Fəzli*

## BULAQ

Yol qırağında bulaq
Sızır qaya döşündən;
Bir tərəfi – ağaclıq,
Bir tərəfi – göy çəmən.

Burda ayaq saxlayır
Hər gün nə qədər insan,
Kimsədən xəbər almır:
– Nəçisən, haralısan?

Hamı üçün sevimli,
Hamı üçün sərindir.
Təbiət – duyanların,
Bulaq – içənlərindir.

*Hüseyn Arif*

## ÖLKƏMİN ÇİÇƏKLƏRİ

Ölkəmin çiçəkləri,
Ey qızlar, ey oğullar!
Bu əziz ana Vətən,
Bu qəlbi odlu diyar
Mərd, igid babalardan
Qalıb sizə yadigar!

Sizindir şiş ucları
Göydələn qarlı dağlar!
Sizindir şırıl-şırıl
Axan büllur bulaqlar!

Füzulinin, Sabirin,
Vurğunun şirin dili
Sizinkidir, balalar,
Sevin bu azad eli!..

*Mikayıl Rzaquluzadə*





## TORPAQ ANADIR, ZƏHMƏT ATA

İnsan yarandığı gündən torpağa güvənir, torpağa arxalanır. Torpaq qayğıkeş ana kimi insanı bəsləyir: yedirir, içirir, geyindirir, isti qoynunda ona sığınacaq verir.



Torpaqla insan arasında ana-bala ünsiyyəti olub həmişə. Öz övladlıq borcunu dərindən dərk edən, ana torpağı qayğı ilə əkib-becərən, qadir əməyi ilə onun şoran sahələrini də yararlı hala salan, dilbər guşəyə döndərən fədakar insanların əməyi hər cür tərifə, alqışa layiqdir.

Azərbaycan torpağının istər yeraltı, istər yerüstü sərvətləri bütün dünyada məşhurdur. Lakin torpaq bu sərvətləri insana elə-belə, havayı vermir. Bunun üçün zəhmət çəkmək, alın təri axıtmaq, torpaqla bağlı peşə və sənətlərə mükəmməl yiyələnmək lazımdır. Əgər torpaq anadırsa, zəhmət atadır. Bütün qalan nemətlər – taxıl, meyvə, tərəvəz, pambıq, tütün və s. torpaq ananın və zəhmət atanın övladlarıdır.

Torpağın qədrini bil,
Torpaq məhək daşıdır.
Ək qoynuna, söyləsin
Nə pisdir, nə yaxşıdır.
O, safları bitirir,
Çürükləri itirir.

Bitirdiyi çayıra, tikana görə qınamayın torpağı. Torpaq ətirli gül-çiçək də bitirir, yamyaşıl ağac da.

*Rafiq Yusifoğlu*

## AZƏRBAYCAN

Sevimli diyar,
Sənsən ilk bahar.
Ürəyimizdə
Doğma adın var,
Azərbaycanım!

Mərd ellərin var,
Yaradar, qurar.
Mavi Xəzərin,
Göy göllərin var,
Azərbaycanım!

Günlər ötüşər,
Yaşa dolarıq.
Biz sənə layiq
Övlad olarıq,
Azərbaycanım!

*Hikmət Ziya*

## BAYRAĞIM

Azərbaycanın müstəqilliyini Avropanın böyük dövlətləri tanımışdı. Bütün Azərbaycanda böyük bayram idi. Atam bu bayramda məndən necə hədiyyə istədiyimi soruşdu. Mən də bir bayraq almasını rica etdim. Sevgili atacığım könlümü qırmadı. Mənə ay-ulduzlu, üçrəngli bir bayraq aldı. Çoxdan bəri belə bayrağımın olmasını arzu edirdim. Axırda şükür olsun ki, muradıma yetdim. Hər zaman asılmış bir bayraq görsəm, dayanıb ona baxıram, onun sağa-sola dalğalanması, ay-ulduzu o qədər xoşuma gəlir ki, tamaşasından doymuram. Bayram günlərində küçələrə çıxaram, dükanları, evləri, bağları, bulvarları bəzəyən şanlı bayraqlarımıza dönə-dönə tamaşa edərəm. Əsgərlər keçərkən də mən onlara tərəf yüyürərəm, gözlərimlə o bayrağı araram. Ona dönə-dönə, ta gözümdən qeyb olana qədər baxaram, düşünərəm, sevinərəm.

Əsgərlik dünyada ən çox sevdiyim bir məsləkdir. Əsgər olmağa böyük həvəsim var.





Bayrağım yatağımın baş tərəfində durur. Hər sabah qalxar, bayrağı öpərəm: "Sevgili bayrağım, arzum budur ki, böyüyəm, əsgər olam, səni qaldırıb şanlı Vətənimizin namusunu xain düşmənlərdən mühafizə edəm".

Bayrağımı gündə bir neçə dəfə ziyarət edirəm. Hər dəfə oxşaram, üzümü ayına-ulduzuna sürtərəm. Bir gün atam görərək:

– Bayrağı bu qədər nə üçün sevirsən? – deyə soruşdu.

Cavab verdim ki, bu bayraq xain düşmənlərin xəyanətini, islam, türk paxıllarını mənə xatırladır. Bu bayrağı qaldırıb onları məğlub etmək istərəm. Vətənə olan məhəbbətimi bununla isbat etmək istərəm.

Atam çox məmnun oldu, qabağımıza gələn Novruz bayramı üçün mənə əsgərlik paltarı və silah aldı.

Bilirsiniz, indi nə qədər sevinirəm, bayramın gəlməsini gözləyirəm. Hərdən əsgərlik əlbisəmi geyirəm, tüfəngimi asıram, bayrağımı qaldırıram, bir əsgər kimi dururam.

– İrəli! Bir, iki! Bir, iki!

*Azərbaycanlı, "Məktəb" jurnalı №21, 1920*

**BAYRAĞIM**

Amalım qədər ucasan,
Bayrağım – adım mənim.
Əməlimtək çıraqban,
Məşəlim, odum mənim.

Dalğalan dəniz vüsətlim,
Bayrağım – adım mənim.
Əyilməz əsgər qüdrətlim,
Pozulmaz andım mənim!

*Fikrət Sadıq*

**YURDUMUZA ARXAYIQ**

Ana yurdun qucağında
Boy atırıq azad, şən.
Bəslər bizi, səslər bizi
Xoş günlərə bu Vətən.

Qoy mahnımız hər tərəfi
Ağız-ağız dolaşsın.
Qoy səsimiz keçilməyən
Meşə keçsin, dağ aşsın.

Yurdumuza bir arxayıq,
Qorxumuz yox davadan.
Sülh var olsun, bahar olsun
Yer üzündə hər zaman!

*Zeynal Cabbarzadə*



**MƏKTƏBDƏ**

Müəllim: – Dünyada insan üçün ən əziz olan şeylərdən nələri bilirsiniz?

Şagirdlərdən biri: – Ən əziz şeylərdən biri Vətəndir.

Müəllim: – Vətən nədir?

Şagird: – Vətən o yerdir ki, şəxsin əqvamı (ata-anası, nəsli) o yerdə yaşayır, ata-babaları o yerdə basdırılmışdır.

Müəllim: – Çox gözəl. Əziz olan şeylərdən daha nə bilirsiniz?

Şagird: – Millət.

Müəllim: – Millət nədir?

Şagird: – Millət o cəmiyyətdir ki, şəxsin Vətənində yaşayıb, onunla bir qanda, bir torpağın tərbiyəti ilə bəslənir.

Müəllim: – Çox yaxşı. Daha nə bilirsiniz?

Şagird: – Elm.

Müəllim: – Elm nədir?

Şagird: – Elm o bilikdir ki, insanın nicatı və xoşbəxtliyinə, rahatlığına və sağlamlığına səbəb olur.

Müəllim: – Çox doğru. Daha?

Şagird: – Əziz şeylərdən biri də dövlətdir.

Müəllim: – Dövlət nədir?

Şagird: – Dövlət o idarədir ki, Vətəni hər cür bəladan saxlayıb istiqlaliyyət ilə idarə edir.

Müəllim: – Bu da gözəl. Daha nə var?

Şagird: – Namus.

Müəllim: – Namus nədir?

Şagird: – Namus - vicdanı, şərəfi, əhli-əyalı, ata və ananı, övladı, milləti hər cür ləkədən saxlamaq deməkdir.

Müəllim: – Afərin, oğlum, daha nə bilirsən?

Şagird: – Ən əziz şeylərdən biri də bu məktəbdir ki, bizə savad, bilik verir.

Müəllim: – Çox gözəl, yenə varmı?

Şagird... (dinmir).

Müəllim: – Deyəsən, həyat yadından çıxmışdır? Nə üçün həyatı əziz şeylərdən saymırsan?

Şagird: – Doğrusu, məncə bu əziz şeylərin yanında həyatın o qədər qiyməti yoxdur ki, onu da sayım.

Müəllim: – Bəs həyat nə üçündür?

Şagird: – Həyat ancaq bir qüvvədir ki, gərək bu saydığım şeylərin yolunda sərf oluna.

Müəllim: – Demək, həyat üçün sənin fikrin...

Şagird: – Bəli, həyat üçün mənim fikrim budur ki, Vətənsiz, millətsiz, elmsiz, namussuz həyatın olmaması olmasından daha yaxşıdır.

Müəllim: – Mərhəba, oğlum! Elədir.

*Müəllim Cəfər, "Məktəb" jurnalı № 3, 1911*

## NAXÇIVAN

Naxçıvan şəhəri Naxçıvan Muxtar Respublikasının paytaxtıdır. Bu şəhər qədim və tarixi bir yol keçmişdir.

Azərbaycan ərazisində ən qədim şəhərlərdən biri olan Naxçıvan təbiəti, öz gözəlliyi və sərvətləri ilə insanları heyran etmişdir.

Naxçıvanın bir tərəfində Araz çayı axır, bir tərəfində Şərur düzü, Xalxal meşəsi, başqa tərəfində büllurlaşmış duz dağları yerləşmişdir.

Naxçıvanın mineral sularından "Badamlı", "Sirab", "Vayxır" ölkəmizdə məşhurdur. Batabat yaylağı, Ordubad bağları göz oxşayır.

Naxçıvanda əsrlərin şahidi olan memarlıq abidələri - Möminəxatın məqbərəsi, Əlincə qalası vardır. Memar Əcəminin naxışları tarixin yaddaşına həkk edilmişdir.

Son 30-40 ildə də Naxçıvanda böyük işlər görülmüşdür. Uca binalar tikilmiş, geniş yollar çəkilmiş, çoxlu bağlar salınmışdır.

İndi Naxçıvana gəzməyə gələnləri ilk heyran edən bir də əzəmətli "Təbriz" mehmanxanası, qoç Koroğlunun, igid Babəkin heykəlləridir.

*Bayram Ələsgərov*






## GƏNCƏ

Gəncə Respublikamızın ən qədim şəhərlərindəndir. O, Bakıdan sonra yurdumuzda ikinci böyük şəhərdir. Xalqımızın dahi şairi, dünya şöhrətli Nizami Gəncəvi Gəncə şəhərində doğulmuş və ölməz əsərlər yaratmışdır. Gəncə ta qədimdən bəri dünya ilə ticarət və mədəni əlaqələri olan mədəniyyət mərkəzimiz kimi tanınır.

## GÖYGÖL

Göygöl dünyanın ən mənzərəli göllərindən biridir. O, Kəpəz dağının ətəyindədir. Gölün suyu təmiz və şəffafdır. Qayıqla göldə gəzərkən istənilən yerdə stəkanla su götürüb içmək olar.

İlin fəsillərindən asılı olaraq göldə suyun hərarəti dəyişir. Yayda suyun səthinə yaxın qatlarda hərarət 18-20 dərəcə olur, qışda isə adətən gölün üzü qalın buz bağlayır.

Göygöldən yuxarıda ondan kiçik bir neçə göl vardır. Bunlardan ən böyüyü Maralgöldür. Göygölə axan Yuxarı Ağsu çayı mənbəyini dağlardan götürür. Göygöldən axan çayın adı isə Aşağı Ağsu çayıdır.

Göygölün çox maraqlı tarixi vardır. 1139-cu ildə Gəncədə baş verən güclü zəlzələ nəticəsində Kəpəz dağının böyük bir hissəsi uçub Ağsu çayının qabağını tamamilə kəsmişdir. Beləliklə, Göygöl əmələ gəlmişdir.

*Bayram Ələsgərov*



## GÖYGÖL

Çiskinli bir gündə gəldim bu yerə,
Dumanda görünməz dumandı Göygöl.
Tənha qayalara, lal meşələrə
Zülmət gecələrdə hayandı Göygöl.

Bir səhər gördüm ki, lal olub yatır,
Kəpəzin dibində burulub yatır.
Qovulan ceyrantək yorulub yatır –
Daş atdım, diksinib oyandı Göygöl.

Döşünü qayıqlar düymətək bəzər,
Dedim bu görkəmlə Xəzərə bənzər –
Qızını yaylağa köçürüb Xəzər;
Baxdı, cilvələndi, nazlandı Göygöl.

Yel əsdi, yarpaqlar suya töküldü,
Göy çitə tünd sarı güllər tikildi.
Buludla ağladı, günəşlə güldü,
Deyəsən, bir kövrək insandı Göygöl.

*Məmməd Araz*





## BAKI

Doğma Respublikamızın paytaxtı Bakı şəhəri Vətənimizin ən iri sənaye və mədəniyyət mərkəzidir. Bakı neftçıxarma və neft emalına görə bütün dünyada məşhurdur.

Yaraşıqlı binaları, böyük meydançaları, mədəniyyət və istirahət parkları, yaşıl və geniş küçələri olan bu şəhər həm də respublikamızın qədim mədəniyyət mərkəzlərindən ən böyüyüdür. Eramızın səkkizinci yüzilliyindən şəhər tipli yaşayış məntəqəsi olan qədim Bakı son yüz ildə daha sürətlə inkişaf etmişdir. Şəhərin böyük zavodları, metro stansiyaları var. Qədim binalar, gözəl parklar, nəhəng tikililər göz oxşayır.

Qız qalası, Şirvanşahlar sarayı İçərişəhərin ən gözəl abidələrindəndir. Vətənimizə gələn müsafirlərin çoxu Bakının gözəl və gözoxşayan şəhər olduğunu deyirlər...

Bakıda böyük təhsil ocaqları, yüksək texnikalı sənaye müəssisələri vardır. Bakı metrosu, muzeylər, mehmanxanalar gözəlliyi ilə hər kəsi cəlb edir.

Bakı dəmir yolları, hava yolları, dəniz yolları ilə bütün dünya ilə əlaqə saxlayır. O, Türkiyənin İzmir şəhəri ilə qardaşlaşmış şəhərdir.

Bakı dünyanın ən təmiz, ən yaşıl, ən səfalı şəhərlərindəndir. Burada yaşamaq, işləmək hər bir insan üçün xoşdur.

*Bayram Ələsgərov*

## BAKI

Qışda soyuq, yayda sərin
Olur mənim küləklərim.
Yaraşıqlı evlərimin
Güzgüsüdür göy Xəzərim.

Heyran olur mənə baxan
Üzüm bitir eyvanımda.
Qatar-qatar göyə qalxan
Buruqlar var dörd yanımda.

Söyüdlərin salxımları
Suya düşür qucaq-qucaq.
Gəl, doyunca gəz bağları,
Dağ üstündən hüsnümə bax.

*İlyas Tapdıq*

## BAKI METROSU

Gülərüzlü Bakının,
Şirinsözlü Bakının,
Xəzərgözlü Bakının
Arzusuydu arzusu –
Bizim Bakı metrosu!

Yer altında işıqlı,
Bəzəkli, yaraşıqlı,
Çiçəkli, sarmaşıqlı
Bir şəhərdir, doğrusu,
Bizim Bakı metrosu!

Enib, qalxır pillələr,
Fərəhim – dünya qədər!
Qoy səni mən bəxtəvər
Gəzim, Bakı metrosu,
Bizim Bakı metrosu!

*Hikmət Ziya*





## DANIŞ, XƏZƏRİM, DANIŞ...

Sən ötən əsrlərin
Şahidisən, səsisən.
Sən Vətən torpağının
Söz dolu sinəsisən!..
Qabarırsan, enirsən,
Aram-aram dinirsən;
Danış, Xəzərim, danış.
Bəlkə xalqın göz yaşı
Axdıqca damla-damla,
Yığmısan, saxlamısan
Hörmətlə, ehtiramla.
Bəlkə köhlən at kimi
Şahə qalxan dalğalar
Həmin göz yaşlarıdır,
Sinəndə tutmur qərar.
Danış, Xəzərim, danış,
Danış Badi - kubənin

Küləyinin səsindən,
Gecə şamı söndürüb,
Evlərin işığını
Talan eləməsindən.
Danış, Xəzərim, danış,
Danış uzaq keçmişin
Qərib axşam çağından.
Danış, Odlar yurdunun
Ən qədim ocağından...
Üstünə mən səpmişəm
Ulduzu, ayı bu gün.
Əskilməz sahilindən
Sənin şənlik, toy-düyün.
Danış, Xəzərim, danış
Sən illərdən illərə,
Bir vaxt bizdən də danış
Gələcək nəsillərə!

*Fikrət Qoca*



## QIZ QALASI

Sən tarixin daş əsgəri –
Məğlub edib əsrləri,
Ucalmısan pillə-pillə,
Qız qalası!
Qocaltmayıb səni illər,
Qız qalası!

Cilalayır səni zaman,
Yuyur yağış, üşüdür qar...
Səndə ötən nəsillərin baxışı var,
Qız qalası!

Daşlarında donub qalıb indiyədək
Hər bahardan bir az çiçək.
Hər payızdan bir az xəzəl,
Hər tufandan bir az külək,
Qız qalası!

*Fikrət Sadıq*



## SABAH ŞƏNBƏ İDİ...

Yanvarın 19-da gecə saat 12-də ən müasir silahlarla silahlanmış ordu Bakıya daxil olub yalın əllə torpağını müdafiə etmək istəyən oğullarımızı, qızlarımızı qana bələdi. İki yüz ilə yaxın bir müddətdə torpağımızdan sorub apardıqları qızıl neftlə bərabər, qızıl qanımızı da tökdülər. Nə idi çiçəyi burnunda ölən yeniyetmələrimizin, torpağımızın bütövlüyünü qorumaq istəyən cavanlarımızın, qız-gəlinlərimizin günahı? Vətən torpağını sevmək, onu qorumaq haçandan günah hesab olunmuşdur? Şəhid olan bu gənclərin ata və babaları məgər 40-45 il bundan əvvəl rus torpağı yolunda öz canlarından keçməmişdimi? Ata-babaların o zaman sizə göstərdiyi xidmətin, fədakarlığın cavabını bezaman nələmi qaytararlar? İki yüz ildir mən sənin qulun oldum, nökərin oldum, gün çıxandan gün batana qədər sənin üçün əlləşdim, sənə canım və qanım bahasına neft verdim, pambıq verdim, taxıl verdim, özüm becərdiyim məhsula özüm həsrət qaldım, sənə göndərdim. Sən mənim hesabıma dünyanın ən qüdrətli dövləti oldun. İndi bu idi mənim yaxşılıqlarımın əvəzi? Biz bu sitəmi götürdük, allah götürməsin!

Sən məni suveren respublika elan etdiyin heç bir il deyil, nə tez sözündən dönüb özün suveren elan etdiyin ölkənin üstünə basqın etdin? Bəs hanı mənim suverenliyim? Sən haçan öz dediyin sözün, altından imza atdığın müqavilənin dalında durmuşdun ki, indi də durasan? Zamanın təbii və qanuni hökmünə boyun əyib xalqlara cüzi azadlıq verməyə məcbur olmuşdun. Bu cüzi azadlıqdan istifadə edib, qaldırdığımız başı nə tez kəsdin?

Yox, başqa cür də ola bilməzdi. Çünki qəddarlıq, zalımlıq imperiyanın təbiətindədir. Sən öz təbiətinə necə xilaf çıxa bilərdin?

*Bəxtiyar Vahabzadə*

## BİR PARÇA TORPAQ

Bir mahal vardı yer üzündə. Laləli, ceyranlı, turaclı düzləri, yamaclı dağları, durnagözlü bulaqları, marallı, əlikli meşələri baxanı heyran qoyurdu. İlxı-ilxı atları, sürü-sürü qoyunları saya gəlməzdi onların. Öz halal zəhmətləri ilə əkər, biçər, yaşayardılar bu dünyada. Kimsənin varında, dövlətində gözləri olmazdı bu tayfanın. Dəliqanlı igidləri at belində quş kimi səkər, qılınc oynadardılar.

Bu mahal ağsaçlı bir müdrik insanı başçı seçmişdi özünə. Adına Böyük ata deyirdi hamı. Bir sözünü iki edən olmazdı dünya dağılsaydı. Hörməti hörmət, ehtiramı ehtiram idi Böyük atanın. Qan-qada ilə işi olmazdı onun.

– Davanızı dağla-daşla edin, igidlərim, – deyərdi həmişə. – Qaya yarın, yol çəkin dağlara, səhralara su çıxarın. Qan axıtmayın, tər axıdın canınızdan. İşiniz onda yüngül olar, təriniz sünbül olar, – deyərdi həmişə.

Qocalar da, cavanlar da həmişə sırğa edərdi qulaqlarında bu müdrik Böyük atanın sözlərini. Uzaq-uzaq ölkələrdən gələn qarətçilərin gözləri götürməzdi bu firavanlığı, bu bolluğu. Həmişə də burunları əzilərdi onların. Bir savaş qurbansız olmazdı. Neçə igid qurban verərdi öz canını el yolunda, qeyrət yolunda. Neçə ananın sinəsi dağlı, neçə sevgilinin gözü yaşlı qalardı davadan sonra. Hamıdan da çox Böyük ata yanardı, yaxılardı öz igidləri üçün.

Bir gün düşmən yenə kəsdirdi qapını, öz pis niyyəti ilə. Mahalın dəliqanlı igidləri silaha sarılıb atıldılar at üstünə.

Böyük ata:

– Səbir edin görək, – dedi, – igidlərim.

İgidlər səbir edib dayandılar. Düşmən elçiləri gəlib çıxdı. Xərac istədilər Böyük atadan. Böyük ata qızırqalanmadı, bir kisə qızıl verdi onlara, elin varından. Hamı sevindi ki, xata sovuşdu.





Səhər tezdən elçilər yenidən göründülər.

Böyük ata:

– Buyurun, – dedi, – indi tələbiniz nədir?

Elçilərdən biri:

– Ulu xaqanımız sizin şəxsi döyüş atınızı tələb edir, – dedi.

İgidlər hiddətləndilər bu sözdən. Böyük ata sakitləşdirdi onları:

– Verin, – dedi, – mənim döyüş atımı onlara! Təki qan-qada sovuşsun bizdən.

Elçilər Böyük atanın döyüş atını alıb apardılar.

Səhər oldu, elçilər yenə gəldilər.

Böyük ata:

– Daha nə istəyiniz var? dedi.

Yenə elçilərdən biri:

Ulu Xaqanımız sizin yeganə oğlunuzu özünə nökər etmək istəyir.

Yenə dəliqanlı igidlər hiddətlənib bağırdılar:

– Biz cəng istəyirik!

Böyük ata sakitləşdirdi onları:

– Bu cəngdə öləcək igidlərimiz mənim bir oğlumdan heç də əskik deyil, – dedi.

Elçilər Böyük atanın tək oğlunu qabaqlarına salıb qul kimi apardılar.

Böyük ata sevindi ki, bununla qan-qada sovuşub getdi, sakitlik yarandı mahalda. Ancaq heç də belə olmadı. Səhər elçilər yenə Böyük atanın qapısını kəsdirdilər. Böyük ata özünü zorla ələ aldı və hiddətlə soruşdu:

– Daha nə istəyirsiniz?!

Elçilərdən biri dedi:

– Ulu Xaqanımız bir parça torpaq istəyir mahalınızdan, məskən salmaq üçün.

Hamının nəzərləri Böyük ataya dikildi. Onun gözləri qəzəbdən alışıb-yandı. Ayağa qalxaraq:

– Haydı, mənim igidlərim! – dedi. – Düşmən həddini aşdı! Düşmənə verdiyim xəraclar mənə məxsus idi. Ancaq torpaq mənim yox, xalqındı. Düşmənə aman verməyin!

Atlandı dəliqanlı igidlər Böyük atanın bir kəlmə sözü ilə. Cəng başlandı, nə başlandı! Qılınclardan şimşək qopdu. Yer-göy dilə gəldi qoç igidlərin nərəsindən. Analar da, bacılar da kişi paltarı geyib, qılınc götürüb döyüşə atlandılar. Bircə günün içində tar-mar etdilər düşmən qoşununu.

Mahaldan öləni də oldu, yaralananı da. Yas saxlamadılar ölənlərə.

– Yasla qələbə bir yerə sığmaz, – dedi Böyük ata.

Mahalda hamı şadlıq etdi. Böyük atanın şərəfinə söz söylədi ozanlar.

– Ən böyük sərvət bir parça torpaqdır, elin sərvəti olan bir parça torpaq, – dedi Böyük ata.

Vətənin bir parça torpağına dastan qoşdular o gecə. Müqəddəsləşdi mahalın bir qarış torpağı beləcə həmin gündən.

*Əli Səmədli*



**QARABAĞ**

Bu dağların qucağında
Bir İmarət-Qərvənd vardı –
o da yandı.

Bu torpağın sinəsində
Tuğ adında bir kənd vardı –
alovlandı.

Bu dünyanın möcüzəsi
Şüşə deyil, meşə deyil,
Meşəliydi.
At üstündə doğulmuşdu,
Ölən günü yas evinin məşəliydi.
Bu ölkənin Cəmillisi
Düşmənlərə çəpər idi,
ayaqlandı.
Kərkicahan bu Vətənin canı idi, –
Kürəyindən bıçaqlandı.
Qadını da kişi olan
Quşçuların dizi altda yer sürüşdü,
Bu millətin yarısına
Məktəb olan Malıbəyli perik düşdü.
Hər kişisi bir ər olan
Qaradağlı obasına dağ çəkildi.
Torpaq yandı, səma yandı, yurd əkildi.
Qarabağda tufan qopdu –
Bu kəndlərin igidləri
Ərənləri gör neçə il
Şirin yuxu yatmadılar,
Bizə namus qorudular,
Bizə torpaq qorudular,
Bu Vətəni satmadılar!

*Ələmdar Quluzadə*



## AZƏRBAYCANIN MİLLİ QƏHRƏMANI AYTƏKİN MƏMMƏDOV

Aytəkin səfalı Şınıx elində – Gədəbəyin Göyəlli kəndində doğulmuşdu. Orta təhsilini doğma kəndlərində aldıqdan sonra 1985-1987-ci illərdə Əfqanıstanda hərbi xidmətdə olmuşdu.

Bakıda təmir-tikinti idarəsində işləyirdi. Ailə quracağını nəzərə alıb, ona işlədiyi idarədən birotaqlı mənzil də ayrılmışdı. Lakin Aytəkin həmin mənzilə getmədi, onun kirayədə olan iş yoldaşına verilməsini müdiriyyətdən xahiş etdi.

Oğlunun boy-buxununa sevinən anası Bəsti xala Aytəkini evləndirmək üçün hazırlıq görürdü. Lakin Aytəkin toyu yalnız qələbə günü edəcəyini söylədi. O, xüsusi təyinatlı milis dəstəsinə yazıldı. Milis dəstəsi xüsusi təlim keçirdi. Aytəkin Əfqanıstan döyüşlərindən bu təlimə hazır idi. O da Çaykənddə qanlı cinayətlər törədən ermənilərlə döyüşmək üçün komandir tərəfindən siyahıya daxil edildi. Aytəkinin dəstəsi qəhrəmanlıqla döyüşüb, erməniləri kənddən çıxmağa məcbur edirdilər. Yaramaz düşmənlər kəndi tərk edərkən əllərinə keçən hər şeyi vəhşicəsinə dağıdır, evlərə od vurur, kəndin sakinlərini girov götürmək istəyirdilər. Bu zaman Aytəkin dəhşətli bir qışqırtı eşitdi. O diqqətlə səs gələn tərəfə baxıb gördü ki, ermənilər bir azərbaycanlı qızı maşına tərəf sürüyürlər.

Onu xilas etmək lazım idi, gecikmək olmazdı. Aytəkin dözmədi, ermənilərə tərəf qaçıb atəş açdı. Quldurları sərrast atəşlə məhv etdi. Qız xilas oldu. Lakin yaxınlıqda gizlənmiş erməni – faşist snayperi Aytəkini nişan alıb alnından vurdu. Onun vətən üçün döyünən ürəyi həmişəlik susdu.

... Aytəkinin qırmızı bəzədilmiş cənazəsini döyüş yoldaşları doğulduğu kəndə gətirdilər. Onun dəfnində yaxın kəndlərin sakinləri, rayon rəhbərliyi və orada düşmənə qarşı mübarizə aparan hərbi hissələrin əsgər və zabitləri iştirak edirdilər. O gün bütün Şınıx mahalı matəm içində idi. Onlar doğma kəndin qəhrəman övladını son mənzilə yola salırdılar. Anası Bəsti xalanın ah-naləsi yeri-göyü yandırırdı. Bəsti xala oğlunun doğma Vətənin düşmənlərdən təmizlənməsi uğrunda canını fəda etdiyini bilirdi. Amma Aytəkin kimi bir oğulun vaxtsız ölümü ananı tüstüsüz alovlandırır və onu yaxından tanıyan insanların ürəyini göynədirdi. Ölümündən sonra ona prezidentin fərmanı ilə Azərbaycanın Milli Qəhrəmanı adı verildi.

Doğulduğu kənddəki orta məktəb indi onun adını daşıyır.

*Oqtay Hüseynli*





## DAĞLAR

*(Bayatılar)*

Dağ başında qara bax,
Üstün alan sara bax.
Aləm cənnətə dönsə,
Mənə xoşdur Qarabağ.

* * *

A dağlar, sona dağlar,
Söz yetməz sona, dağlar.
Yaz fəsli göllərində
Çalxanar sona, dağlar.

* * *

Gəzmişəm, Murov, səndə,
Getməz qar, qırov səndə.
Yüz il ovçuluq etdim,
Vurmadım bir ov səndə.

Bu dağlar qoşa dağlar,
Verib baş-başa dağlar.
Səndə dostum gəzibdir,
Səni yüz yaşa, dağlar.

* * *

Dağlar marala qaldı,
Otu sarala qaldı.
Soyuq bulaq, göy yaylaq
Yenə marala qaldı.

* * *

Başı çalmalı dağlar,
Dibi kölgəli dağlar.
Oturub yol gözlərəm,
Haçan el gəli, dağlar?!





## SALATIN

Vətənin unuldulmaz,
Mərd qızıdır Salatın;
Günəşin də, Ayın da
Bacısıdır Salatın.

Ən ağır döyüşlərdə
Cəbhələrə girib o.
Bizdən ötrü qələmi
Süngüyə çevirib o.

Üstünə güllə yağıb
Yol gedərkən Turşsuya.
Şuşanın, Kəlbəcərin
Dərdini duya-duya.

Salatının tək, əziz
Ceyhun adlı oğlu var;
Çox keçməz, bütün ölkə
Ceyhunu da tanıyar.

Harayına hay verib
Hər günün, hər saatın.
Vətənin unudulmaz,
Mərd qızıdır Salatın!

*Oqtay Rza*

## İTIRİLMİŞ AÇAR

Qız ağlayırdı. Özü də hıçqırtı ilə ağlayırdı. Anasının ona dönə-dönə tapşırdığı açarı bulaqdan su gətirəndə itirmişdi. Birinci dəfə idi ki, evlərinin açarını itirirdi.

Anası, atası işdə idi. Qız qapılarını qıfılladı, balaca səhəngi götürüb kəndin başındakı bulağa yollandı. Bütün yolboyu açarı ovcunda bərk-bərk tutmuşdu. Bulaq kimsəsiz idi. Açarı səki daşının üstünə qoyub, səhəngi şırıltı ilə axan suyun altına tutdu. Səhəngi doldurub geri döndü. Samovarı bulaq suyu ilə doldurub ona od saldı. Çalışırdı ki, samovar tez qaynasın, ata-anası gələndə çayları hazır olsun.

Qız sentyabrda məktəbə gedəcəkdi. Atası ona məktəbli paltarı almışdı. O, ata-anası evdə olmayanda təzə paltarını geyər və güzgünün qarşısında özünə fərəhlə tamaşa edərdi. Yenə təzə paltarları yadına düşdü, gedib onları geyinmək istədi. Qapını açmaq istəyəndə açarı tapmadı. Hər yeri axtardı, açar yoxa çıxmışdı. Artıq hava qaralmaqda idi. Qız bulağa gedən yolla yerə baxa-baxa küçəyə çıxdı, ancaq qaranlıq düşdüyündən qorxub geri qayıtdı və ağlamağa başladı. Xoşbəxtlikdən anası bu gün işdən tez gəldi. Qıza elə gəlirdi ki, anası onu ya döyəcək ya da bərk danlayacaq. Ancaq belə olmadı. Anası onun göz yaşlarını silib, başını tumarladı. Samovarın dızıltısını eşidib sevindi. Axı ilk dəfə idi ki, qızı təkbaşına su gətirmiş, samovara od salıb qaynatmışdı.

– Ağlama, qızım, ağlama. Bu saat ya açarı taparıq, ya da atan gəlib çıxar.

Qız sakit oldu.

– Bəlkə bulağın başında qoymusan açarı, gəl gedək baxaq.

Bulaq başında həmin açarı çoxları görmüşdü. Götürüb baxıb, yerinə qoymuşdular. Yəqin sahibi çıxar, - demişdilər.

Axşamdan bədirlənmiş ay aləmi öz nuruna qərq etmişdi. Bulaq başı kimsəsiz idi, suyu da zümzümə ilə



axıb gedirdi.

Onlar bulağa yetişəndə qızcığaz öz əli ilə qoyduğu açarı götürüb çox sevindi. Belə itkiyə nə var ki, yaman başı atası gəlib öz açarı ilə qapını açacaqdı, vəssalam. Anası da ona dönə-dönə tapşıracaqdı ki, bir də bulağa gedəndə açarı özü ilə aparmasın.

Həmin hadisədən sonra qızcığaz doqqazdan ayağını çölə qoyanda açarı özü ilə götürmürdü, eyvandaca gözə görünməyən yerdə gizlədirdi.

Qızın da, kəndlərinin də bu sakit və xoşbəxt günləri pozuldu. İllərlə qonşuluq etdikləri, süfrələrinin qırağını kəsdirən ermənilər bircə gündə düşmən kəsildi onlara. Elə həmin vaxtdan da qanlı-qadalı günləri başladı. Bir qorxulu gecədə isə yer göylə qarışdı. Qulaqlarının dibindəcə dəhşətli gurultular qopdu. Hamını şirin yuxudan diksindirib oyatdı bu gurultular. Ağacdan toyuqlar tökülüb pərən-pərən oldular gecəyarı. Qoyun-quzular mələşdi gecəyarı. İtləri Pələng zingildəyib zənciri qırmaq istədi, sonra da qorxusundan büzüşüb tülküyə döndü. Çox uzaqdan gələn həyəcanlı bir səs getdikcə yaxınlaşıb az qalırdı qulaqları batırsın:

– Evlərinizi tərk edin! Qaçın! Qaçın! Üstünüzə ölüm gəlir!

Ata da, ana da, qızcığaz da alt paltarlarında çıxmışdılar gecənin bu aləmində eyvana. Hava soyuq olmasa da, onların dizləri əsirdi vahimədən. Atəş səsləri yaxında gəlirdi. Evə qayıdıb geyinməyə başladılar. Qızcığaz şkafda səliqə ilə asılqana keçirilmiş məktəbli paltarının üstünə cumdu, ancaq əli gəlmədi onu götürüb geyinsin...

– Ana, biz hara gedirik? dedi.

– Qaçırıq, qızım, qaçırıq.

– Nə geyinim?

– Əlinə nə keçdi, geyin!

Qızcığaz yenə istədi məktəbli paltarını geysin, ancaq qıymadı. Axşam əynindən çıxarıb stolun başından asdığı

paltarını tələsik əyninə keçirib eyvana çıxdı. Anası qapıları bağlayıb açarları qıza verdi.

– Al, bərk saxla, itirmə, – dedi.

Sonra da qalın yun şalını onun başına salıb, uclarını arxadan bərk-bərk çəkib bağladı.

– Arxamca gəl! – deyib pilləkəni necə düşdüyünü bilmədi. Pələng zingildəyə-zingildəyə zəncirdə qaldı. Həyəcandan nə atası eşitdi onun səsini, nə də anası.

Onlar küçəyə çıxan kimi məhlənin adamlarına qoşulub kəndin aşağı tərəfinə doğru qaçmağa başladılar.

Qız çətin də olsa anası ilə birtəhər ayaqlaşırdı. Ona elə gəlirdi ki, qaçan təkcə insanlar deyil, yer də, göy də, ağaclar da harasa qaçırdı. Ancaq heç kim hara qaçdığını bilmirdi.

Kənddən xeyli aralanıb meşənin içində dayandılar. Hamı bir-birini axtarırdı. Hamı itib-batanını, bir-birindən aralı düşənini axtarırdı, soraqlaşırdı.

Qızcığaz anasının əlindən bərk-bərk tutub buraxmaq istəmirdi. Bir əlində isə evlərinin acarlarını tutmuşdu və tez-tez anasına üz tutub deyirdi:

– Ana, açarları itirməmişəm.

Ana isə nəvazişlə:

– Əhsən, mənim balam, – deyirdi.

Ancaq anasının qəlbindən qara qanlar axırdı. O düşünürdü ki, görəsən bir də evlərinə dönə biləcəkmi, bir də qızın ovcunda bərk-bərk tutduğu açarla qapılarını aça biləcəklərmi?

Qızın isə ananın bu dərdli, ələmli düşüncələrindən xəbəri yox idi. Onun yeganə təsəllisi ovcunda bərk-bərk tutaraq itirmədiyi açarları idi.

*Əli Səmədli*





## ANACAN, İŞIĞI KİM SÖNDÜRÜB?

Ata-anası onun adını Sevinc qoymuşdular. Bu adı qızlarına ona görə vermişdilər ki, Sevinc qəm-qüssə görməsin, sevinc içində boya-başa çatsın. Həmişə dodaqlarında şən gülüş olsun. Böyüyüb xoşbəxtliyə, səadətə qovuşsun. Bu, Sevincin ata-anası kimi bütün ata-anaların arzusudur. Axı hamı öz balasını yaxşı böyütmək, xoşbəxt eləmək, onu səadətə qovuşdurmaq arzusu ilə yaşayır. Sevincin də ata-anası belə düşünərdilər, belə açardılar hər səhəri, belə qarşılayardılar hər gələn axşamı. Amma bu arzular, bu istəklər onların ürəyində dondu, nə Sevincin ata-anasına, nə də özünə qismət oldu...

* * *

Sevincin beş yaşı tamam olmuşdu. Atası onun üçün şəkilli kitab almışdı, anası təzə, güllü bir don tikmişdi. O, sevinə-sevinə donu qızına geyindirdi. Sonra onu güzgü qabağına gətirdi, ipək saçlarını daradı. Saçlarının ucuna qəşəng, rəngbərəng bant bağladı. Sevinc güzgüdə dönə-dönə özünə baxdı. Onun sevinci yerə-göyə sığmadı. Elə bildi ki, bu dünyada ondan qəşəng, ondan xoşbəxt uşaq yox-

dur. Anasının boynunu qucaqladı, o üzündən, bu üzündən öpdü. Anası da üzünü qızının üzünə söykədi, özünü xoşbəxt ana sandı, sevinci aşdı-daşdı...

Axşam süfrə başına yığışdılar. Gülə-gülə, şənlənə-şənlənə yedilər, içdilər. Sevinci təbrik etdilər. Elə bu vaxt evin işığı söndü. Ata durub pəncərədən çölə baxdı. Bütün evlərin işığı sönmüşdü. Bayaqdan ailədə olan sevinc bir anın içində yoxa çıxdı. Sevincin yerinə təlaş, qorxu doldu evə. Nə isə dəhşətli bir şey gözlənilirdi. Birdən gurultu səsi eşidildi. Ata küçəyə çıxmaq istədi. Ana onu buraxmadı. Ana atanın qolundan bərk-bərk tutmuşdu. Gözləri dörd olmuş Sevinc isə anasının ətəyindən yapışmışdı. Vıyıltı ilə evlərin arasından yana-yana keçən güllələrin, mərmilərin səsinə qulaq asırdılar.

Gurultu, atışma, qışqırtı şəhəri bürümüşdü. Küçələrdə tanklar, toplar nərildəyirdi. Ana daha atanı saxlaya bilmədi. Ata evdən çıxıb döyüşə getdi. Ana Sevinci qucağına alıb başılovlu şəhərdən qaçan insanlara qoşuldu. Hansı tərəfə getdiyindən də xəbərsiz idi. Beynində bircə o dolaşırdı ki, ermənilərə rast gəlməsin. Bu, ölümdən betər olardı. Ana körpəsini sinəsinə sıxıb qaçır, qaçırdı. Göydən qar ilə birlikdə güllələr yağırdı. Yanan evlərin od-alovu göyə bülənd olmuşdu. Hər tərəf alov içində idi. Körpəsini qucağına götürmüş ananın özü də alova düşmüşdü. Yüyürən, qaçan alov idi.

Ermənilər rus əsgərlərinin köməyi ilə Xocalını işğal etmişdilər. Orada yaşayan azərbaycanlıların az bir hissəsi çox çətinliklə qaçıb canını qurtarmışdı. Yerdə qalanlarını ermənilərlə ruslar ucdantutma qırmışdılar. Küçələr, yollar insan cəsədi ilə dolu idi. Evlərdə, həyətlərdə vəhşilər ailələri uşaqlarla birlikdə məhv etmişdilər. Yaralıların inilti və zarıltısından adam dəhşətə gəlirdi. Erməni quldurları inildəyən yaralılara işgəncə verməkdən ləzzət alırdılar. Bununla da öz vəhşiliklərini bir daha sübut edirdilər. Rus ordusunda xidmət eləyən, Xocalının işğalında iştirak eləyən bir özbək bu mənzərəyə baxıb dəhşətə gəldi. O öz silahını atıb, meşə yolu ilə Ağdam tərəfə qaçdı. Nifrət elədiyi işğalçı ordudan canını qurtarmaq istəyirdi. Özbək gizli meşə yolu ilə gedərkən inilti səsi eşidib ayaq saxladı. Dayanıb ətrafa diqqətlə qulaq asdı. İnilti lap yaxında idi. Səsə tərəf getdi. Yaralı bir uşaq qara batmışdı. Rus ordusundan qaçan özbək yaralı uşağı götürüb bağrına basdı və yoluna davam elədi. Bir neçə saatdan sonra gəlib Ağdama çatdı. Onun gətirdiyi yaralı uşaq Sevinc idi...



* * *

Sevinc Bakıdakı xəstəxanada yatırdı. Ayaqlarını, əllərini don vurmuşdu. Həkimlər onun ayaqlarını, əllərini sağaltmaq üçün əllərindən gələni əsirgəmirdilər. Bunun üçün müxtəlif müalicə usullarına əl atırdılar. Amma Sevinc bunların hamısından xəbərsiz idi. Çünki hələ özünə gələ bilməmişdi. Hələ heç xəstəxanaya düşdüyündən də xəbər tutmamışdı. Həkimlər gecə-gündüz onun yanında otururdular. Çalışırdılar ki, Sevinci yaşatsınlar. Həkimlər çox çalışdılar. Bir həftədən sonra həkimlərin ümidi artdı. Artıq Sevincin üzü bəri dönmüşdü. Sevinc huşsuz olsa da bəzi sözləri deyirdi. Onun dilə gəlib danışması həkimlərə ümid verirdi ki, sağalacaq. Bir gün Sevinc yataqda anasını çağırmağa başladı:

– Ana, ay ana!

Qadın həkim Sevincə cavab verdi:

– Nədi, qızım, nə istəyirsən?

– Bizim işığımız niyə yanmır?

Həkim bilmədi Sevincə nə cavab versin. İşıq yanmağına yanırdı, amma Sevinc bu işığı görə bilmirdi. Çünki erməni başkəsənləri onun gözlərinin ikisini də çıxarmışdılar. Bundan Sevincin xəbəri yox idi. Elə bilirdi gözləri yerindədir. Ağrıları dayanmışdı. Ona görə gözlərinin çıxarıldığını unutmuşdu. Həkim kövrəldi. Qəlbinin ağrısı gözlərinin yaşına dönüb yanağına süzüldü:

– Qızım, darıxma, hamının evində işıq sönüb. Yananda bizim də evdə yanacaq.
– Anacan, niyə sönüb, kim söndürüb işığı?
– Bilmirəm, ay qızım, sönüb, bütün evlərdə sönüb işıq. Hər yanda qaranlıqdır, mənim gül balam.
– Ana, ay ana, yenə işığımızı ermənilər söndürüb?
– Yox, yox qızım, özü sönüb. Burda erməni nə gəzir?
– Niyə nə gəzir? Xocalının o tərəfi ermənidir də.
Həkim başa düşdü ki, Sevinc elə bilir Xocalıda – öz evlərindədir. Xəstəxanada yatdığından xəbəri yoxdur.
– Qızım, qorxma, erməniləri atangil qovub, Xocalıdan uzaqlaşdırıblar. Yat, qorxma, ta bura ermənilər gələ bilməz.
– Erməni yoxdusa, bəs işığımızı kim söndürüb, hə, anacan?
– Ay qızım, dedim ki, öz-özünə sönüb.
– İşığımızı erməni söndürüb, anacan, erməni.
Sevinc o tərəf-bu tərəfə döndü yataqda. Yenə halı pozuldu, dəyişdi. Həkim iynə vurdu. Özü də çarpayıda – Sevincin yanında oturdu. Əlini onun alnına qoydu. Bir azdan Sevinc tərləməyə başladı. Üzündə, alnında puçur-puçur tər əmələ gəldi. Onun yuxuya getdiyini hiss edən həkim ayağa qalxdı. Öz-özünə dedi: "Qoy yatsın, deyəsən, yavaş-yavaş özünə gəlir. Yazıq yuxusuzdur, ağrılar onu yatmağa qoymur".
Sevinc dərin yuxuya getmişdi. Yuxuda gördü ki, beş yaşı tamam olub. Anası ona qəşəng bir don tikib. Atası isə şəkilli bir kitab alıb gətirib. Anası tikdiyi donu geyindirdi ona. Apardı güzgünün qabağına. Saçlarını açıb daradı. Saçlarının ucuna kəpənəkli bant bağladı onun. Sevinc güzgüdə özünə baxdı. Ona elə gəldi ki, indi dünyada ondan qəşəng, gözəl və xoşbəxt uşaq yoxdur. Anasının boynunu qucaqladı, o üzündən, bu üzündən öpdü. Anası üzünü onun üzünə yaxınlaşdırıb dünyanın xoşbəxt anası hiss elədi özünü. Sonra qalxıb süfrə açdı. Süfrənin başına yığışdılar. Elə bu vaxt otağın işığı söndü, küçədən güllə səs-





ləri eşidildi. Sevinc qışqırıb yuxudan oyandı. Həkim onu sakitləşdirməyə başladı:
– Qorxma, qızım, heç nə yoxdu, qorxma.
– Anacan, işığımız niyə yanmır?
– Yanacaq, qızım, yanacaq, darıxma.
– İşığımızı erməni söndürüb?
– Yox, qızım, yox, özü sönüb.
– Bəs nə vaxt yanacaq?
– Darıxma, yanacaq, qızım, yanacaq.
– Bəs mənə tikdiyin gözəl don hanı?
– Qoymuşam sandığa, qızım, işıq yansın, gətirib verəcəyəm, geyəcəksən.
– Bəs saçlarıma bağladığın kəpənəkli bantlarım hardadır, anacan?
– Onları da sandığa qoymuşam, qızım, işıq yansın, gətirib saçlarına bağlayacam.
– Bəs atam alan şəkilli kitabımı neyləmisən?
– Elə onu da sandığa qoymuşam, donunla, bantınla bir

yerdədir. İşıq yansın, hamısını gətirəcəyəm.

– Anacan, bəs niyə işığı yandırmırlar?

– Yandıracaqlar, qızım, yandıracaqlar, darıxma.

Sevinc heç nə demədi, susdu. Həkim onun alnını, üzünü, saçını sığalladı. Qız həkimin əlində mehribanlıq duydu, xoşlandı, yenə yuxuya getdi.

Sevinc dərin yuxuya getmişdi. Gördü ki, Xocalıda – evlərinin həyətində qonşu qızı Sevdayla oynayır. Bahar gəlib, bağlarındakı qızılgüllər açılıb. Ağaclarda bülbüllər cəh-cəh vurur. Quşlar sevinə-sevinə uçub budaqdan-budağa qonurlar. Sevinclə Sevda gah yaşıl ağaclara, qızılgüllərə, gah cəh-cəh vuran bülbüllərə, gah da yarpaqların arasında oynaşan sərçələrə tamaşa eləyirdilər. Anası həyətdəki iri tut ağacının budağından nehrə asmışdı, çalxayırdı. Elə bu vaxt atası gəldi. Anası nehrəni yarımçıq qoyub tut ağacının altında süfrə açdı. Günorta yeməyi üçün süfrə başına yığışdılar. Bismillah eləyib, çörək kəsdilər. Elə bu vaxt hər tərəfi qaranlıq bürüdü. Güllələr vıyıldadı, toplar guruldadı. Sevinc atasından yapışıb qışqırmağa başladı:

– Ata, ay ata, qorxuram, ermənilər gəlirlər.

Həkim Sevincin səsini eşidən kimi onun yanına qaçdı.

– Nə olub, qızım, nə olub? Niyə qışqırırsan? Nədən qorxursan? Qorxma, bala, qorxma!

– Anacan, niyə hər tərəf qaranlıqdır? Axı indicə hər yan işıq idi. Günəşli gün idi. Qızılgüllər açmışdı. Bülbüllər oxuyurdu. Sərçələr ağacların yarpaqlarının arasında oynaşırdılar. Niyə birdən qaranlıq çökdü hər yana? Bəs günəş necə oldu, anacan?

Həkim bilmədi Sevincə nə cavab versin. Axı onun sualı elə sual idi ki, cavab vermək çox çətin idi. Həkim çıxış yolu axtarırdı onu sakitləşdirmək üçün.

– Hə, niyə dillənmirsən, anacan? Bəs günəş necə oldu? Niyə birdən-birə hər yan qaranlıqlaşdı? Mən heç vaxt günün günorta çağı belə qaranlıq görməmişəm.

– Qızım, sənin nə yaşın var ki, görəsən? Mən çox görmüşəm. Bəzən günün lap günorta çağı elə qaranlıq çökür ki, heç nəyi seçmək olmur. Bax, elə bugünkü kimi. Buludlar gəlib günün qarşısını kəsib. Heç mən də səni görmürəm, əzizim, ancaq səsini eşidirəm. İndi buludlar çəkilər, hər yan işıqlanar.

– Axı indicə ermənilər top atırdılar. Bəlkə gedib günəşə dəyib. Günəş, sönüb? Ona görə bəlkə belə qaranlıqdır?

– Yox, qızım, topun gülləsi gedib günəşə çata bilməz. Günəşin üzünü buludlar tutub, indi çəkilər, hər yan işıqlaşar.

– Axı ermənilər indicə top atırdılar.

– Hə, atırdılar, qızım. Bizimkilər onlara yamanca cavab verdilər. Düz Xankəndə qədər qovdular.

– Anacan, bəs atam hara getdi?

– İşə getdi, qızım, işə. Bir azdan qayıdıb gələcək, darıxma.

– Bəs Sevda necə oldu, anacan?

– Kim, qızım?

– Sevdanı deyirəm də, dostumu, bizim qonşunu. Tanımırsan?

– Niyə tanımıram, bala, tanıyıram. Qaranlıq düşəndə anası apardı. Hava işıqlananda gəlib səninlə oynayacaq yenə. Darıxma, toxta, bala.

Sevincin qulağına bu vaxt yenə top səsləri gəldi. O, başladı yenə qışqırmağa. Həkim nə qədər çalışdısa, onu sakitləşdirə bilmədi. Əlini üzünə tutub qışqırırdı:

– Ay aman, ermənilər gəlir, bizi qıracaqlar!

Qışqırdıqca onun qulaqlarında elə hey top guruldayırdı. Həkim onu sakitləşdirmək üçün yenə iynə vurmalı oldu. Sevinc huşunu itirdi, səsini kəsdi. Onun qulaqlarında artıq top guruldamadı.

Sevincin xəstəxanaya düşdüyü gündən xeyli keçmişdi. Səhhəti də bir az babatlaşmışdı. Ətrafda olan hər şeyi hiss eləyirdi, duyurdu, amma bir şeydən baş aça bilmirdi. Baş aça bilmirdi ki, niyə həmişə qaranlıq olur. Axı gözlərinin

çıxarıldığından xəbəri yox idi. Axşam Sevinci yedizdirdilər. Həkim onun yanına gəldi, çarpayısının üstündə oturdu. Sevincin ipək saçlarını tumarladı:

– Hə, qızım, necəsən?

– Yaxşıyam, anacan. Bəs bu işığı niyə yandırmırlar?

– Darıxma, mənim balam, yandıracaqlar.

Həkimin səsi Sevincin anasının səsinə oxşamadı. Sevinc duruxdu:

– Sən kimsən?

– Mən sənin ananam, qızım.

– Yox, sən mənim anam deyilsən. Mənim anamın səsi ayrıdır.

– Sənin ananam, qızım, niyə sən öz ananı tanımırsan? Mən sənin ananam. Adım da Səkinədir.

– Hə, adın mənim anamın adıdır, amma səsin ayrı səsdir. Bəs atam hanı?

Kişi həkim dilləndi:

– Mən də burdayam, qızım, burdayam.

Sevinc yenə duruxdu:

– Yox, sənin də səsin atamın səsinə oxşamır.

– Qızım, sənin atanam. Məni niyə tanımırsan? Atanam, adım da Fərruxdur.

– Axı bu işığı kim söndürüb? Yandırın işığı, baxım görüm siz mənim ata-anamsınız, yoxsa yox. Yandırın işığı, baxım, yandırın, yandırın!

Sevinc yenə qışqırmağa, fəryad eləməyə başladı. İşığın yandırılmasını tələb elədi. Amma başa düşə bilmədi ki, bu dünyada işıq onun üçün ata-anası kimi həmişəlik ölüb və yoxa çıxıb.

*Qaçay Köçərli*





## QƏHRƏMAN ÇİNGİZ

Vətənin unudulmaz,
Qəhrəman Çingizi var;
Yaşayır ürəklərdə
Onun keçdiyi yollar.

Yurdumuz çağıranda
Oğul tək and içib o;
Qarabağa yollanıb,
Öz canından keçib o.

Videolentə köçürüb
Müsibətli anları, –
Dünya tanısın deyə
Günahsız qurbanları.

Videolentə köçürüb
Əsrin fəlakətini
Min-min ürək ağrıdan
Xocalı dəhşətini.

Neçə-neçə Cavanşir,
Babək, Gəray, Həzi... var;
Vətənin unudulmaz,
Qəhrəman Çingizi var!

*Oqtay Rza*



## ÜRƏK XATİRƏSİ

Rahat yatın, igidlər!
Məşəl olub könlünüz.
Şəfəq kimi, nur kimi
Əbədidir ömrünüz.

Ey köynəyi qanından
Al bayrağa dönənlər!
Məşəllərin dililə
Danışanlar, dinənlər!

Vətən sizi unutmaz,
Ürəklərdə yaşarsız.
Arzunuzu ellərin
Arzusuna qoşarsız.

*Rüfət Zəbioğlu*





# İLLƏR ƏBƏS ÖTMƏSİN



## QOŞA SÖYÜD

Kəndin kənarında iri bir söyüd ağacı vardı. Yayın isti aylarında o hər tərəfə qol-budaq atıb sərinlik yayırdı. Uzaq yoldan kəndə gələnlər bu ağacın kölgəsində dincəlməmiş kəndə girməzdilər. Salxımları aşağı sallanmış yaşıl budaqlar az qala yerə dəyirdi. Başında da hər yay sağsağanlar yuva tikərdi.

Ağac o qədər hündürdü ki, kəndin hər tərəfindən başı görünürdü.

Bu ağac nə vaxt əkilmişdi? Bunu hamıdan yaxşı Cəlal bilirdi. Cəlalın cəmi doqquz yaşı vardı. Ağacın tarixini isə ona qoca babası Nüsrət danışmışdı. Nüsrət babanın yaşı səksəni ötmüşdü. Ancaq sağlam bədənli, qədd-qamətli bir kişi idi. O, kənddə bağban işləyirdi. Nüsrət baba kəndin heç bir işindən kənarda durmazdı. Bütün meyvə bağları ona tapşırılmışdı. O, həmişə, xüsusilə yay aylarında Cəlalı da özü ilə meyvə bağlarına aparır, ağacları ona göstərir və onlara necə qulluq etməyi öyrədirdi.

Bir gün onlar bağlardan qayıdarkən dincəlmək üçün yoldakı söyüd ağacının dibində oturdular. Qoca başını qaldırıb ağacın qol-budaqlarına baxdı, sonra üzünü nəvəsinə tutdu.

– Cəlal, görürsənmi? – dedi, – bu, kənddə ən qoca



ağacdır. O, məndən azca kiçikdir.

– Nə üçün səndən kiçikdir? – deyə Cəlal təəccüblə soruşdu.

– Onu mən əkmişəm, o zaman mən sən yaşda idim...

Babası bu sözləri deyib fikrə getdi. Əlini ağ saqqalına sürtdü. Sonra gözlərini qıyıb dedi:

– Mənim babam da sənin baban kimi bağban idi. Mənə ağac əkməyi öyrətmişdi. O zaman kəndimizdə ağac az idi. Bu yerlərdə elə isti olurdu ki, adamın nəfəsi tutulurdu. Bir gün babam mənə dedi: “Nüsrət, gəl burada ağac əkək...” Gördüyün bu ağacı, bir də yolun o tərəfində bir ağac yerə basdırdım. Onlara qulluq elədim. Biri tutdu, o birisi isə susuzluqdan qurudu.

Qoca sözünü qurtardı və qurumuş ağacın yerini göstərib ah çəkdi.

– Yoxsa indi qoşa söyüd olacaqdılar.

Babası susdu. Söyüdün yarpaqları yenicə başlayan küləkdən əsməyə başladı. Cəlal gözlərini babasının gözlərinə zilləyib soruşdu:

– İndi daha əkmək olmaz? Qoy o tərəfdə də ağac olsun.

Nəvəsinin bu sualından onun qırışıqlar içərisində batmış gözləri işıldadı:

– Nə üçün olmur, bala! Qoy o da sənin adına olsun.

– Bəs daha qurumazmı?

– Yox, bala, o zamanlar çoxdan keçdi. İndi suyumuz boldur. İki çeşməmiz var. Kənddə nə əksən tutar.

Bu söhbətdən düz bir il sonra yekə söyüdün üzbəüzlüyündə cavan bir söyüd tingəsi yarpaqladı. Qollu-budaqlı qoca söyüdün yanında onun zərif yaşıl yarpaqları ipək kimi parlayırdı. Bir il də keçdi. Körpə söyüd xeyli yekəldi. Kəndin girəcəyində onlar baba ilə nəvəni xatırladırdı.

*Xalidə Hasilova*

## İLLƏR ƏBƏS ÖTMƏSİN

Zaman keçir, il dönür,
Bahar gedir, qış gəlir.
Bizi qocaldan illər
Ömrümüzə xoş gəlir.

Biz illərin qoynunda
Gülüş əkək, gül əkək.
Sözü – işə, arzunu –
Əməllərə döndərək.

Əməlləri, işləri
Ölçməyək illərlə biz.
Çıxaq vaxt ölçüsündən
Böyük əməllərlə biz.

İllər gəlib keçsə də
Töhfələri bol olsun.
İllər əbəs ötməsin,
Şəhər olsun, yol olsun.

*Bəxtiyar Vahabzadə*

## YENƏ DAĞLARDAN TÜTƏK SƏSI GƏLIR...

Alı kişi boz quzu dərisindən olan papağını gözünün üstə basıb axşam-səhər ucları gümüşə tutulmuş tütəyini çalırdı. O, əlli il idi ki, çobandı, günü-güzəranı bu dağlarda keçmişdi. Uzun illər fermanın baş çobanı olmuşdu. Ancaq kənddə çoban Alı desəydin, heç kim tanımazdı. Ya gərək İlanvurmaz Alı deyəydin, ya da ki, Zurnaçı Alı. Uşaqdan-böyüyə hamı onu belə çağırardı. Hər iki adın öz tarixçəsi vardı.

... Alı südəmər uşaq ikən anası onu hər gün özü ilə biçənəyə apararmış. Bir gün arvad yatmış körpəni şaxlı-budaqlı bir qarağacın altında sərdiyi palaz parçasının üstünə qoyub, ailənin başqa üzvləri ilə birlikdə ot çalmağa gedir. Günün qızmar vaxtı o bir loğma çörək yemək və ağac kölgəsində yatmış körpəsini əmizdirmək üçün hamıdan qabaq qayıdır. Qarağaca beş-altı addım qalmış onun dizləri bükülür, tükləri ürpəşir: palaz parçası üstündə yatmış körpənin sinəsi üstündə iri bir qızıl ilan qıvrılmışdı. İlan arabir başını qaldırıb dəhşətli gözlərini mışıl-mışıl yatan körpənin üzünə dikirdi.

Arvad əvvəlcə camaatı çağırmaq istədi, sonra uşağı oyatmaqdan və ilanı qəzəbləndirməkdən qorxub yavaşca dizə kimi qalxmış otların arasıyla kömək dalınca getdi. Bir neçə dəqiqədən sonra arvadlar, kişilər qarağacın ətrafını aldılar. Ancaq kimsə irəli getməyə cəsarət etmirdi. Çünki camaat qayıdıb gələnə kimi körpə oyanmışdı. Arabir qalxıb başını o tərəf-bu tərəfə hərlədən ilanın hərəkəti, görünür, uşağı əyləndirirdi. O, sevincindən qəşş edir, totuq ayaqlarını yerə basıb qarnını qaldırır, əllərini uzadır, hərəkət edən başı tutmağa çalışırdı. Kimsə yerindən tərpənmirdi. İlanı nə vurmaq, nə də hürkütmək mümkün deyildi. Bu dəhşətli oyun bir neçə dəqiqə davam etdi. Birdən ilan körpənin üstündən sürüşdü və göz qırpımında otların arasında qeyb oldu.

Bu vaxt sehrlənmiş kimi yerində duran ana çığırıb özündən getdi. O gündən sonra Alının adı İlanvurmaz Alı qaldı.

Alı kişinin ikinci adı Zurnaçı Alı idi. O, kənddə tütək çalması ilə məşhurdu. Kəndin bir toyu, bir düyünü onsuz keçməzdi. Mal-qara dağa köçən vaxt kimsə toy eləməzdi. Çünki o məclisdən ki, İlanvurmaz Alının tütəyinin, zurnasının səsi gəlmədi, o məclis ləzzət verməzdi. Alı tütəyi çalan zaman başqa zurnaçılar kimi ordlarını şişirdib qızarmazdı. Tütəyi elə bil heç özü üfləməzdi. O, ancaq gözlərini yumar, arabir dodaqlarını tərpədərdi. Barmaqlarını tütəyin dəlikləri üzərində gəzdirdikcə hardansa ürəkdən gələn, ecazkar qüvvəyə malik olan səslər axar, onu dinləyənlərin qəlbini altüst edərdi. Deyirlər ki, İlanvurmaz Alı cavanlıqda kəndin gözəl qızlarından birinə dəlicəsinə vurulubmuş. Qız da onu sevirmiş. Alı elə o qızla da evlənibmiş. Ancaq deyilənə görə, bu sevginin ömrü çox qısa olub.

Bu nakam məhəbbətdən ona təkcə bu tütək yadigar qalmışdı. Alı da bütün meylini ona salmışdı.

Yaylaqda fermanın cavan çobanları axşam Alı kişinin tütəyinin səsini eşidən kimi başına toplaşardılar. Alı da gələnlərə fikir vermədən papağını gözünün üstə çəkər, gözlərini yumub hey çalardı. Çaldıqca da sinəsinə tökülmüş çal saqqalı dodaqlarının hərəkətinə uyğun titrəyərdi. Onun

nəğməsində baharın xoş nəfəsi, yarpaqların pıçıltısı, uzaq cavanlıq çağlarının gözəl xatirələri canlanar, vəfasız sevgilinin həsrəti duyulardı. Alı çaldıqca, elə bil özü də cavanlaşırdı. Üzündəki, alnındakı dərin qırışlar hamarlaşar, gözləri parıldar, nəzərləri lap uzaqlara dikilər, oralarda kimi isə axtarardı. Bu sadə qarğı tütəkdən çıxan səslərin təsiri altında qulaq asanların gözlərinə gah kədər pərdəsi çəkilər, gah üzləri gülümsər, gah da qaşları düyünlənərdi. Alının tütəyinin səsini eşidən əlində nə iş görsəydi, nə düşünsəydi, bir an duruxar, əl saxlar, uzaqdan gələn bu ecazkar səsləri bilaixtiyar dinləməyə başlardı.

Alının qəribə bir dinləyicisi də vardı. Onu hamı Qoçaq deyə çağırardı. Alı elə ki, çalmağa başladı, o qəribə dinləyici hələ uzaqdan tütəyin səsini eşidən kimi düz gəlib Alının qabağında oturar, tay qulağını şəkləyər, salamat gözünü yumub dinləməyə başlayardı. Onun o biri gözü şikəst olduğundan yumulmazdı. Elə beləcə aralı qalardı. Bədənindəki boz tüklərin bircəciyi də tərpənməzdi, uzaqdan baxan elə bilərdi ki, o yatıb. Ancaq lümək quyruğunu hey o tərəf-bu tərəfə bulamağından bilərdin ki, oyaqdır. Bu yaşı ötmüş eybəcər köpəyə baxanda bilaixtiyar fikirləşərdin ki, görəsən buna niyə "Qoçaq" deyirlər. Onun harası qoçaqdır? Əslində, kənd camaatı ad qoymağı sevir. Bəzən bu ad tutarlı olur. Bəzən də elə ayama qoyurlar ki, sahibinə baxanda ancaq heyrət edirsən.

Həmişə Alının yan-yörəsində vurnuxan bu tayqulaq, lüməkquyruq, yerindən güclə tərpənən boz köpəyə də Qoçaq deyəndə adamı gülmək tuturdu.

Bir dəfə mən Alı kişi ilə dizbədiz oturmuşdum. Qoçaq da həmişəki kimi öz sahibinin düz qabağında, başını pəncəsinə söykəyib uzanmışdı. Alının balaca nəvəsi hey əlindəki qarğını uzadıb köpəyin gah böyrünə, gah dalına, gah da alnına vururdu. Köpək dəcəlin dürtmələrinə səbirlə dözür, yerindən belə tərpənmirdi. Dürtmə onu çox incidəndə başını qovzayıb Alıya baxır, sonra yenə tay gözünü yumurdu.





Alı uşağın dəcəllik elədiyini görüb yanındakı çubuğa əl atdı.

– Ay uşaq, qoysana oturaq, – deyə çığırdı. – Sən onun qocalmış gününə rast gəlmisən. Eləliyinə baxma, səni şilküt edər. Heç gözünü qırpmağa vaxt tapmazsan. Ağıllı heyvan mənə hörmət eləyir. Yoxsa dədəni yandırmışdı.

Uşaq çəkilib bir kənarda oturdu.

Alı heyvanın başını tumarlaya-tumarlaya deyirdi:

– Hə, qoca, necəsən, hanı qurd basdığın, pələnglə vuruşduğun vaxtlar? Yaxşı deyiblər ki, kiminin əvvəli, kiminin axırı.

Mən gülümsədim. Alı kişi baxışımı tutub dedi:

– Oğul, görürəm sən də mənim dostuma xor baxırsan. Üzə vurmasan da fikirləşirsən ki, görəsən Alı bu boz köpəkdə nə görüb? Bu ad ki var ha, o doğulanda verilən adı demirəm, sonra camaat tərəfindən verilən ayamanı deyirəm nahaq yerə, göydəndüşmə olmur. Onu sonradan əməlinə görə qazanırsan. Bizim bu Qoçağın da cavanlıqda şöhrəti bütün mahala yayılmışdı. Onun qorxusundan bu həndəvərə bir canavar dolana bilməzdi.

Bir dəfə də malı dağa köçürən vaxtlar idi. Sürünü yaxındakı kəndə yun qırxımına aparırdıq. Günün qızmar vaxtı özümü bir ağacın kölgəsinə verdim. Qoyunun çoxunu çobanlar aşağıdakı dərəyə sürmüşdülər. Aramız çox deyildi,

dedim qoy gün əyilsin, sonra gedib onlara çataram. Yanımda üç köpək vardı, bir də bir tüfəng. Əslində tüfəngi elə-belə götürərdim. Oğru-əyrini hürkütmək üçün. Beləcə oturub tütək çalırdım, qoyunlar da otlayırdı. Bir də gördüm bizim bu Qoçaq yerindən dik atıldı, sürünün həndəvərinə dolandı, sonra ağzını bataqlığa sarı çevirib hürdü. Bir xeyli irəli getdi, yenə geri qayıtdı. O biri itlər də ona qoşuldular. Ancaq onlar irəli getməyə cəsarət etmirdilər. "Günün bu vaxtı sürüyə canavar, qurd təpinə bilməz", deyə fikirləşdim. Vallah, o başına and olsun, sürü bir anda elə sıxlaşmışdı, o bizim ağılsız heyvan dediyimiz qoyunlar bir-birinin böyrünə elə qısılmışdılar ki... Dedim: "Alı, yaxşı yerdə axşamladın". Cəld tüfəngi aldım, havaya bir güllə atdım. Elə bu vaxt bataqlıq tərəfdəki qamışlıqdan iri, boz bir baş çıxdı. Heyvan xallı iri pəncəsi ilə qamışları aralayıb sürüyə tərəf baxdı. Gözlərindən qan damırdı. "Canavar!" - deyib ayağa qalxdım. Tüfəngi qaldırdım, heyvan yerindən sıçradı. Bir də atılsa idi, düz üstümüzü alacaqdı. Qoçaq irəli cumdu. O biri köpəklər də cəsarətə gəlib onun dalınca getdilər. Canavar itin birinin leşini elə bir göz qırpımında o tərəfə atdı. Gördüm heyvanın gözü qızıb, onunla bacarmaq çətin məsələdir, naəlac qalıb tez özümü sürünün içərisinə verdim. Yunu qırxılmamış qoyunun arasında bürküdən boğulurdum. Çarəm nə idi?! Hər dəqiqə mənə bir il görünürdü. Qulağım yerdə idi. Nə vaxtdan-nə vaxta at tappıltısı eşitdim, bildim ki, haraya gəliblər. Canavar iki itin leşini sərmişdi. Bizim bu Qocağı yarımcan eləmişdi. Bir-iki qoyunu da murdarlamışdı. Ancaq haraya gələnlər vaxtında özlərini yetirmişdilər.

Alı kişi Qoçağa baxıb gülümsünürdü. Onun gözlərində, üzündə, köpəyin belini tumarlayan iri əllərində bu heyvana qarşı elə böyük bir məhəbbət hiss olunurdu ki... Deyəsən, Qoçaq da bunu duyurdu. O, hey gözünü açıb-yumur, tay qulağı və burnunun pərləri titrəyirdi. Alı kişi heyvanı oxşaya-oxşaya dedi:



– Eh, vəfalı dostum, nə eləmək olar?! Dünyanın işi belədir! İndi qocalmısan, sənə xor baxırlar. Fikir çəkmə! Alı yanındadır. Qədrini bilən var.

Alı sinə dolusu dərindən bir ah çəkdi. Məğrur nəzərlərini uzaq, təpəsi dumanlar içərisində əriyib görünməz olan Şahdağa dikdi. Onun saçı-saqqalı ağarsa da, gözləri çox cavan görünürdü. Mən diqqətlə bu gözlərə baxdım, orada böyük bir həyat şövqü vardı. Alı başını dik tutmuşdu. Zamanın onun məğrur çiyinləri üstünə qalaq-qalaq yığdığı yetmiş illik yükü qocanın belini bükə bilməmişdi. Mən baxdıqca bilaixtiyar onun cavanlığı, çiynində yapıncı, at belində çapdığı vaxtlar, onun gözəl sevgilisi gözlərim önündə canlanırdı. Alı görünür, yenə baxışlarımı tutmuşdu. Onun qəribə xasiyyəti vardı. Ürəyindən keçəni baxışlarından oxuyurdu. Elə görünür, buna görə də dedi:

– Oğul, zahiri gözəlliyə heç vaxt bənd olma! Qızılı qara torpaqda axtar. İncini dərin dəryaların dibindəki çirkin balıqqulaqlarının içərisindən çıxarırlar. Hər parıldayan şeyə qiymətli gövhər deməzlər. Sən bu boz, çirkin köpəyə nə baxırsan, sən onun qoçaqlığından danış.

– Alı kişi əlini atıb ucları gümüşə tutulmuş qarğı tütəyini çıxartdı. Tütəyin başını dizinə çəkib sildi. Sonra onu ağzına apardı. Əvvəlcə xırda dağ çaylarının şırıltısını xatırladan səslər axdı, nə axdı... Bu səslər məni qoynuna alıb istədiyi səmtə apardı...

*Ələviyyə Babayeva*





## DƏMİRÇİ

Dəmirçi kömür
Atır kürəyə,
Dəmirçi dəmir
Atır kürəyə.
Kömür kürədə
Qığılcımlanır, –
Kömür köz olur,
Köz xıncımlanır.
Dəmir kürədə
Qovruldum demir.
Dəmir o dəmir –
Dəmir od əmir.
Dəmirçi əli
Dəmir kimidir.

Qızarmış dəmir
Xəmir kimidir.
Çəkic endikcə
Qığılcımlanır,
Qığılcımları
Qıvırcımlanır...
Dəmir o dəmir –
Dəmir od əmir.
Odda yanmasa,
Qoxarlanmasa,
Balta olarmı?
Atılar küncə,
Əldə olarmı?..

*İlyas Tapdıq*



## YAXŞI İŞ

Yurik səhər yuxudan oyandı. Pəncərəyə baxdı. Günəş çıxmışdı. Hava xoş idi.

O, yaxşı bir iş görmək istədi.

Oturub fikirləşməyə başladı: "Əgər bacım suda boğulsaydı, mən onu o dəqiqə xilas edərdim".

Elə bu vaxt bacısı ona yanaşdı:

– Yura, məni gəzməyə apar!

– Get burdan, mane olma. Fikirləşirəm!

Bacısı inciyib getdi.

Yura isə fikirləşdi: "Əgər dayəmin üstünə canavarlar düşsə, mən onları güllə ilə vurardım".

Elə bu vaxt dayəsi ona yaxınlaşdı.

– Yuracan, qabları yığışdır.

– Özün yığışdır. Mənim vaxtım yoxdur!

Dayə başını yırğaladı. Yura isə yenə fikrə getdi: "Əgər Trezorka quyuya düşsə, mən onu o saat oradan çıxarardım".

Elə bu vaxt Trezorka onun yanına gəldi. Heyvan quyruğunu bulayaraq sanki: "Yura, mənə su ver!" deyirdi.

– Rədd ol get, mane olma! Fikirləşirəm.

Trezorka ağzını yumub kolların arasına girdi.

Yura isə anasının yanına getdi:

– Ana, axı mən yaxşı bir iş görmək istəyirəm. Nə eləyim?

Anası Yuranın başını tumarlayaraq dedi:

– Bacını gəzməyə apar, qabları yığışdırmaqda dayənə kömək et, Trezorkaya isə içməyə su ver.

*Valentina Oseyeva*



## UÇAN ÇIRAQLAR

Möcüzədir, möcüzə,
Uçar, gəzər çıraqlar.
Meşələrə, düzlərə
İşıq salar, nur salar.
Tanış olun, çırağın
Adı Atəşböcəyi

Otların yaraşığı,
Ağacların bəzəyi.
Çəmənlərə, çöllərə
Şölə salar bu böcək.
Yanırsa – yaşayır o,
Sönübsə – ölüb demək.

*Zahid Xəlil*



## ÇÖRƏK

A qızıl sünbülüm, ağırlaş, saral!
Kəhrəba rənginlə boya zəmini.
Sən olmayan yerdə arzular solar,
Dən-dən ol, tel-tel ol, baxım, sevinim.

Torpağın cövhəri, günəşin nuru,
Buludun göz yaşı qarışıb sənə.
Səni görməsəydim dayanıb, durub
Nə çölə baxardım, nə göy çəmənə.

Kövrək saman çöpü olsa da gövdən
Söykənib çiyninə bu Yer kürəsi.
Əziz saxlayırlar səni hər evdə,
Əziz saxlayırsan sən də hər kəsi.

*Fikrət Sadıq*



## QUŞLARIN MƏNFƏƏTİ

Bizim vilayətin kəndlərinin birində o qədər meyvə bağları var idi ki, kənardan baxan adama kəndin hər yeri bir bağ hesabında görünürdü. Bu kənddə bahar fəslində ağaclar yaşıl yarpaqdan don geyinib al-əlvan çiçəklə bəzənmiş idi. Ağacların koğuşlarında və budaqlarının arasında quşlar hərəsi bir cür nəğmə çala-çala buradan-oraya, oradan-buraya uçub ötürdülər. Bülbüllərin cəh-cəhi, qaranquşların oxumağı, iki qardaş "Yusif-Nəsib" quşunun bir-birini çağırmağı, sarı sandal quşunun "Ayran çilov, südlü plov" deyib bağırması hər tərəfə səs salmış idi.

Payıza yaxın ağacın yaşıl yarpaqları arasından qırmızıyanaq almalar, sapsarı saralmış tüklü-tüklü şaftalılar və heyvalar, al-əlvan armud, üzüm və gavalılar görünüb, tamaşası aləmi heyran qoyurdu.

O kəndin tərbiyəsiz uşaqları yığılıb, harada quş yuvası gözlərinə sataşsaydı dağıdır və balalarını götürürdülər. Miskin və məğmun quşlar bu zülmü görüb, o kənddən ayaq çəkib köçdülər, bir də o kəndə gəlmədilər.

Payız getdi, qış keçdi, yaz açıldı, bu kəndin bağlarında quş sədası eşidilmədi. Kəndin hər tərəfi səssiz-səmirsiz bir xarabaya bənzəyirdi. O qurdlar, cücülər ki, qabaqda quşlar onları hesabsız qırıb tələf edirdi, indi öz kefləri ilə ağaclara daraşıb çiçəklərini və yarpaqlarını yeyib ağacları təmiz soymuşdular. Yayın ortasında ağaclar qış fəslində olan kimi çılpaq qalmışdı. Kəndə baxanın ürəyi qan ağlardı.

O il payız düşdü. O vilayətdə daha əvvəlki kimi sarı heyvalar, şaftalılar əmələ gəlmədi və nə qara, qırmızı üzümlər və almalar bitmədi, nə də bir dənə quş nəğməsi eşidilmədi.

*Rəşidbəy Əfəndiyev*

## İPƏK PALTAR

– Bel sapı kəs, ay baba!
– Bel nəyinə gərəkdi?
– Bağda quyu qazıram,
Bəlkə bir çəkil əkdim.
– Neyləyirsən çəkili?
– Qoy çəkil budaqlansın.
– Neyləyirsən budağı?
– Qoy budaq yarpaqlansın.
– Neyləyirsən yarpağı?
– İpəkqurdu saxlaram,
Yemlərəm, yarpaqlaram.
Yaxşı bəsləsəm əgər,
Qurd mənə ipək verər,
Geyərəm ipək paltar.
Gün dəydikcə parıldar.

*Məmməd Aslan*



## YOLDAŞLIQ KÖMƏYİ

Hər zaman şən, bəxtiyar,
Gülərüzlü Ənvərin
Gözlərində bir dərin
Kədər duydu uşaqlar.
Sual verib yer-yerdən
Soruşdular Ənvərdən:
– Nə var?
Sənə nə olub?
– Nədəndir rəngin solub?
– Anam xəstədir bir az,
– Qorxma, heç bir şey olmaz.
– Qorxuram, ancaq mənim
Vaxtım yox dərs öyrənim.
– Qorxma, anan sağalar.
Dərsinçün də vaxt qalar,
Ev işlərini burax,
Gecə yatma, dərsə bax, –
Təsəlli verib Sərvər
Söylədi belə sözlər,
Lakin dinmədi Elman,
Məktəbdən çıxan zaman
Başqa səmtə yönəldi,
Düz Ənvərgilə gəldi.
Kömək etdi Ənvərə,
Danışmadı boş yerə.

*Mehdi Seyidzadə*



## OĞULLAR

İki arvad quyudan su çəkirdi. Üçüncü bir arvad da onların yanına gəldi. Ağsaqqal bir qoca da dincini almaq üçün daşın üstündə oturmuşdu.

Arvadlardan biri o birinə dedi:

– Mənim oğlum çox cəld və qüvvətli uşaqdır. Heç kim onunla bacara bilmir.

O biri arvad öz oğlunu tərifləyərək:

– Mənimki isə bülbül kimi ötür. Onun səsi kimi səs heç kimdə yoxdur, – dedi.

Üçüncü arvad isə dinmirdi. Yanındakı arvadlar ondan soruşdular:

– Bəs sən nə üçün öz oğlun haqqında bir söz demirsən?

Arvad cavabında dedi:

– Nə deyim, onda tərifəlayiq elə bir xüsusiyyət yoxdur.

Arvadlar vedrələrini su ilə doldurub yola düşdülər. Qoca da onların dalınca gedirdi. Arvadlar gah gedir, gah dayanırdılar. Onların qolları ağrıyır, su ətrafa səpələnir, belləri qırılırdı.

Birdən qarşıda üç oğlan göründü.

Onlardan biri mayallaq aşır, təkər kimi yuvarlanırdı. Arvadlar ona baxıb fərəhlənirdilər.

O biri nəğmə oxuyurdu, bülbül kimi ötürdü, arvadlar ona həvəslə qulaq asırdılar.

Üçüncü oğlan anasını görcək onun yanına yüyürdü, ağır vedrələri əlindən alıb evə yollandı.

Arvadlar qocadan soruşdular:

– Hə, necədir? Oğlanlarımız xoşuna gəldimi?

Qoca cavab verdi:

– Oğlanlarınız haradadırlar? Mən burada yalnız bircə oğul görürəm.

*Valentina Oseyeva*



## BAĞLAR

Yaz budağı çiçək-çiçək,
Yay yarpağı ləçək-ləçək,
Payız barı gözəl-göyçək,
Yeni bağlar, ulu bağlar,
Qoynu nemət dolu bağlar.

Kölgələrin sərin-sərin,
Bir aləmdir hər səhərin.
Şirin, meyxoş meyvələrin
Min bir dərdə şəfa, bağlar,
Qoynu dolu səfa bağlar.

Budaqların peyvənd-calaq,
Narın, heyvan qalaq-qalaq.
Alma, armud, qozun bitraq,
Sıralanıb düzəl, bağlar!
Bir-birindən gözəl bağlar!
Göy sinəsi bahar bağlar!
Qoynu dolu nübar bağlar!

*Rəsul Rza*



## QURU ÇÖRƏK

Yadulla baba kənddən şəhərə qonaq gələndə nəvələri üçün maraqlı əhvalat, hekayət, unudulmaz, kövrək xatirələr də gətirərdi. Babanın şirin nağıl kimi danışdığı əhvalat və rəvayətləri uşaqlar elə maraqla dinləyirdilər ki!.. Baba müharibədə göstərdiyi qəhrəmanlıqdan, faşistlər üzərində qazanılan qələbədən, əsl cəbhə dostluğundan, ac-susuz, yuxusuz keçən günlərdən söhbətlər edərdi.

Yadulla babanın söylədiyi nağılların, əhvalatların, xatirələrin bir qismi də çöreklə bağlı olardı. Çünki müharibənin qanlı-qadalı illərində bir tikə çörək də güllə, avtomat, pulemyot, top qədər vacib olub, qiymətli sayılıb. Yadulla baba deyərdi ki, müharibədə təkcə əsgərlər, tanklar, pulemyotlar, mərmilər, təyyarələr düşməni Berlinədək qovmayıb, bir tikə çörək də düşməni darmadağın etməkdə köməkçimiz olub.

Yenə bir gün Yadulla baba nəvələrinin yanına gəlmişdi. Nəvələr süfrə başına yığışmışdılar. Süfrə yığışdırılanda hərənin qabağında xeyli çörək qalmışdı. Sonuncu tikələri heç kim yemir, hərə özündən kənara itələyirdi.

Şam vaxtı Yadulla babanın təkidi ilə yenə həmin çörək tikələri süfrəyə gəldi. Nəvələrdən heç birisi əvvəlki tikələri bəyənmədi. Hərə yenə təzə çörəkdən tikə kəsib yeməyə başladı. Axırda isə süfrədə əvvəlki tikələrin yanında bir xeyli təzə tikələr qaldı. Bunu görən Yadulla baba nəvələrinə acıqlandı:

– Baba bu dəfə sizdən bərk inciyir! Bir də belə etsəniz, sizə nağıl, əhvalat danışmayacağam...

Sonra kiçik fasilə verib dedi:

– Məgər siz çörək haqqında danışdığım söhbətləri yaddan çıxarmısız? Çörəyə etinasız yanaşmaq olmaz və bu çox günahdır.

Baba belə etdi ki, nəvələri çörək kimi əziz, qiymətli nemətə laqeyd qalmasın, hər tikənin, hər qramın qədir-qiymətini bilsin.

Nəvələri Yadulla babanı çox istəyirdilər. Onun sözləri-

ni hər dəfə çörək yeyəndə yadlarına salır, çörəyə hörmətlə yanaşırdılar.

*Ağaddin Mansurzadə*

## YANĞIN İTİ

Çox zaman şəhərlərdə yanğın baş verərkən uşaqlar yanan evlərdə qalır və onları çıxarmaq mümkün olmur. Çünki uşaqlar qorxudan gizlənib səslərini çıxarmırlar, tüstü isə onları görməyə imkan vermir. Yanan evlərdən uşaqları çıxarmaq üçün xüsusi itlər öyrədilmişdi. Bu itlər yanğınsöndürənlərlə bir yerdə olurdular. Yanğınsöndürənlər həmin itləri yanan evdən uşaqları çıxarmağa göndərirlər. Belə itlərdən biri 12 uşaq xilas etmişdi; onun adı Bob idi.

Günlərin birində bir evə od düşmüşdü. Yanğınsöndürənlər bu evə gəlib çatdıqda bir qadın qaça-qaça onların yanına gəldi. O iki yaşlı qızının evdə qaldığını ağlaya-ağlaya söylədi. Yanğınsöndürənlər Bobu həmin evə göndərdilər. Bob pilləkənlə yuxarı qalxıb tüstünün içində gözdən itdi. 5 dəqiqədən sonra it qaça-qaça evdən çıxdı. O, dişləri ilə evdə qalan qız uşağının köynəyindən yapışıb gətirirdi. Anası uşağın üstünə yüyürdü və qızının salamat qaldığını görüb sevindiyindən ağladı. Yanğınsöndürənlər itin başını tumarlayır və ona baxırdılar ki, görsünlər alov onu qarsmayıb ki? Amma Bob yenə evə tərəf can atırdı. Yanğınsöndürənlər evdə yenə kiminsə qaldığını zənn edərək iti buraxdılar. İt yüyürə-yüyürə evə girdi və çox keçmədən yenə geri qayıtdı. Bu dəfə də it dişində nə isə tutmuşdu. Camaat itin bu dəfə evdən çıxardığı şeyə baxdıqda gülüşdülər: it dişində böyük bir kukla gətirirdi.

*Lev Tolstoy*







## GÜLSABAH

Mənim bir neçə nəvəm vardır. Hamısını da çox istəyirəm və əzizləyirəm. Ancaq bu nəvələrin içində balaca Gülsabahın ayrıca bir yeri vardır. Hər meyvənin bir dadı-təmi olan kimi, hər oğul-qızın barı-bəhrəsi olan hər bir nəvənin də özünə görə bir dadı-təmi, bir gözəlliyi, bir tamaşası vardır... Mən bu qıza bir dünyaca istədiyim anamın adını qoymuşam... Ancaq Gülsabah Bakıda yox, öz ata-anasının yanında, uzaq kənd rayonunda yaşayır. Arabir Gülsabah öz ata-anası ilə Bakıya da gəlir. Mənsə Gülsabah gələn qatarı qarşılayıram, bir müddətdən sonra Gülsabah gedən qatarı yola salıram. Əvəzində Gülsabah borclu qalmır, o da məni qarşılayır və yola salır. Baxırsan ki, Gülsabah dövrəmə dolanır, heç bilmir ki, əziz babasına necə qulluq eləsin. Mən işdən, ya gəzməkdən qayıdanda hamıdan əvvəl Gülsabah qabağıma çıxıb qayğıma qalır, ucadan deyir:

Baba acdır!... Tez babaya çay-çörək!..

Əlimi yuyub qurtarınca Gülsabah evdəkilərə kömək edir, xörək-çörəyi süfrəyə daşıyır, işə qoşulub cani-dildən çalışır. Bir azdan özü də gəlib yavaşcadan yanımda əyləşir.

Gülsabahın belə qayğıkeşliyini görəndə öz anam yadıma düşür. Axı anam da mən uşaq olduğum zaman, içəriyə girər-girməz mehribanlıqla qarşılayıb soruşardı: "Yəqin ki, yamanca acmısan eləmi?.."

*Süleyman Rəhimov*



## HEÇ NƏ İSTƏMƏYƏN QIZ

– Ata, güllü bir corab al,
Heç nə daha istəmirəm.
Sən tülkülü bir kitab al,
Heç nə daha istəmirəm.
Bir plaş al, iki bayraq,
Bir qara zont, bir ağ papaq,
Heç nə daha istəmirəm.
– Qızım, özgə nə alım mən?
– Qırmızı lent, yaşıl qələm,
Heç nə daha istəmirəm...

*Nəriman Həsənzadə*



## ULDUZ SƏRVƏTİ

Yerdədir göylərin bütün neməti,
Göylərdən torpağa çələng hörmüşəm.
İnsandır torpağın ulduz sərvəti,
Günəşi torpaqdan doğan görmüşəm.

Ən böyük dərinlik ürəklərdədir,
Ən təmiz göylər də insan gözündə,
Ən geniş üfüqlər diləklərdədir,
Ən böyük işıq var insan sözündə.

*Çingiz Əlioğlu*

## HIÇQIRIQ

Güldəstə xala oğlu Mehdini səslədi:

– Ay oğul, get bibingildən süd gətir.

Mehdi evə girib bir parça çörək kəsdi. Yeyə-yeyə yola düşdü. Kənar yola çıxmayıb, arxadan bibisigilin bağına adladı. Uzaqdan iri gövdəli ağacın altına düşmüş qırmızı almalar onun diqqətini cəlb etdi. Çatan kimi iki alma götürüb hərəsini bir cibinə saldı. Elə bil hıçqırıq onun əyilməsini gözləyirmiş, qalxan kimi hıçqırmağa başladı: hıq-hıq. Elə hıçqıra-hıçqıra da bibisinin yanına gəldi. Süd aldı. Getmək istəyirdi ki, gözləmədiyi bir hadisə baş verdi. Bibisi üzünü Mehdiyə tutub dedi:

– Bala, niyə oğurluq etmisən, ayıb deyilmi?

Mehdi tutuldu. Ordundakı çörəyi güclə uddu.

"Yox, mən oğurlamamışam, yerə düşmüşdü, götürdüm, onsuz da çürüyəcəkdi", – deyib utana-utana cibindəki almaları çıxardı.

Bibi gülümsündü. Onun sözü necə də yerinə düşmüşdü. Mehdinin az qala ağlayacağını görüb əlavə etdi:

– Eybi yoxdur, götür, oğlum, mən bunu dedim ki, sən hıçqırmayasan. Axı belə bir qayda var: kim ki, hıçqırdı, onu nə iləsə təəccübləndirmək lazımdır. Təəccüb hıçqırığı unutdurur. Bir də yadında saxla ki, adam yol gedə-gedə çörək yeməz. Çörək nəfəs borusuna düşə bilər. Elə hıçqırıq da bundan yaranır.

Mehdi doğrudan da daha hıçqırmırdı...

*Əjdər Ağayev*





## QONAQ GƏLSƏ...

Torpağın sinəsi yuyunar şehlə,
Üfüqlər köksünü açar zirvəyə.
Qızıl təbəssümlə, qızıl fərəhlə,
Günəş muştuluğa uçar zirvəyə.

Qonaq bir qapıdan keçməmiş hələ,
Bütün ürəklərdən keçər obada.
Bulağın suyundan içməmiş hələ,
Güllərin ətrini içər obada.

Hansı həyətədir gələnin yolu?
Şenliyin hamısı xəmir yoğurar.
Qonağı nə şaxta, nə qar, nə dolu,
Təkcə təndirlərin istisi vurar.

Özünü qayadan atan qovağın,
Xatirəsi yanar sacayağıda.
Tezcə acdığını duyub qonağın,
Gurlanar alovu od-ocağın da.

Sazın harayını erkən eşidib,
Doqqaz hənirlənər, doqqaz küyləşər.
Qonaq şamı olar evin, eşiyin, –
Hamı işığına gəlib əyləşər.

*Ələsgər Əlioğlu*



## QIZILGÜL

Gülərin nənəsi bu dəfə kənddən gələndə bir dəstə qızılgül gətirmişdi. Gülər qızılgül dəstəsini görən kimi sevindi. Öz-özünə dedi: "Nə yaxşı oldu, bu gün anamı təbrik edəndə gülü ona verərəm".

Zibeydə nənə bir stəkan çay içib ayağa qalxdı:

– Qızım, Gülər, gedim xalangilə də dəyim, sonra yenə sizə gələcəyəm. O vaxtacan Elxan da oyanar...

Gülər nənəsini qucaqlayıb ona yalvarırdı:

– Nənə, nə olar, axşam da bizdə yatarsan, hə?

Sonra əlavə etdi:

– Bu gün anamın anadan olan günüdür, bilirsən, düz qırx yaşı tamam olur.

Gülər nənəsini həyət qapısınacan yola salıb evə döndü. Stolun üstünə baxdı. Qızılgül dolçada yox idi. Öz-özünə təəccüblə dedi:

– Bıy, bəs gülü kim apardı?

Tez Elxan yatan otağa baxdı:

– Yəqin ki, Elxan götürüb, – dedi.

Gülər otağa girən kimi Elxan yorğanı başına çəkib xoruldamağa başladı. Gülər yatağa yaxınlaşdı. İki əliylə Elxanın çiyinlərindən tutub silkələdi:

– Gülümü ver, nənəm onu mənə bağışlayıb.



Elxan dik atıldı. Yalandan gözlərini ovuşdurmağa başladı:

– Gül? Nə gül? Mən yatmışam.

Gülər Elxandan üzr istəyib dəhlizə keçdi. Elə gülün fikrində idi. Çox axtardı, amma tapa bilmədi. Özlüyündə belə fikirləşdi:

– Hə, yəqin nənəm yaddan çıxarıb, yenidən zənbilə qoyub aparıb. Gələr, soruşaram.

Elxan yatağından qalxıb əl-üzünü yudu, geyindi, əyləşib xeyli saata baxdı, barmaqlarını saydı, birdən soruşdu:

– Gülər, ana yenə saat beşdə gələcək?

Qızılgülün itməsindən fikrə düşmüş Gülər:

– Elxan, zəhləmi tökmə, çayını iç, çörəyini ye, get oynamağa. Görmürsən, işim çoxdur, ana gələnə kimi evi təmizləməliyəm, sənin nə vecinə.

Elxan:

– Gülər, – dedi, – bundan sonra sən də söz soruşsan mən deməyəcəyəm.

– Yaxşı, deməzsən! – deyə Gülər hörüklərini ata-ata döşəməni yumağa başladı.

Günortadan xeyli keçmiş Zibeydə nənə gəlib çıxdı. Elxanı dönə-dönə öpüb bağrına basdı. Gülər nənəsinin yanına gəlib astaca soruşdu:

– Nənə, qızılgülü bilməyib yenidən zənbilinə qoymamısan?

Nənə təəccübləndi:

– Yox, qızım, – dedi. – Elə stolun üstündə qoyub getdim ki... necə məgər?!

– Heç, – deyə Gülər dərindən ah çəkdi. – Xeyli axtardım, tapa bilmədim. Heyf, yaxşı güllər idi, anama bağışlayacaqdım.

Bunu eşidən Elxan öz-özünə dedi: "Ay bağışladın ha! Gülü mən bağışlaram, sən də görərsən!"

Bir qədər keçdi. Fabrikin fiti eşidildi. Elxan sevincək dedi:

– Ay nənə, indicə anam gələcək, iş qurtardı!

Səhərdən bəri evə tıq-tıq salmış saatın əqrəblərinə ba-

xan Güləri tər basdı, onun ürəyi şiddətlə döyündü: "Eh, bəs mən anamı nə ilə təbrik edəcəyəm?"

Elxanın isə sevinci qəlbinə sığışmırdı. O, atılıb-düşür, şkafın gözündə gizlətdiyi qızılgül dəstəsini oradan çıxarmağa fürsət axtarırdı. Birdən qapı açıldı, Zibeydə nənə. Gülər həyətə çıxdılar. Elxan cəld o biri otağa keçdi, şkafı açdı, qızılgül dəstəsini götürüb həyətə qaçdı. Anasının qucağında al-əlvan böyük bir gül dəstəsi vardı. O, Elxanı öpüb qucağındakı gül dəstəsini ona uzatdı:

– Al, oğlum, – dedi. – Bu gülü mənə fabrikdə bağışlayıblar.

Gülər çox pərt oldu:

– Ana, məni bağışla, – dedi. – Mən böyüyəndə sənə anadan olan günündə gör nə alacağam! İndi səni hədiyyəsiz qarşılayıram.

Anası gülə-gülə içəri girdi. O, tərtəmiz süpürülmüş və yuyulmuş, hər yeri səliqəyə salınmış otaqlara baxdıqda gözlərinə inanmadı. Hədsiz maraq içində soruşdu:

– Bu otaqları kim belə səliqəyə salıb? Ay ana, deyəsən, bu yenə sənin işindir, hə?

Zibeydə nənə səsləndi:

– Yox, ay Fəridə, işin hamısını Gülər görüb. Göz dəyməsin, mən indiyə kimi on yaşlı qızda belə səliqə görməmişəm.

Anası Gülərə dedi:

– Qızım, sən hey hədiyyədən danışırsan. Məgər bu övladın öz anasına ən qiymətli hədiyyəsi deyilmi?

Elxan tutduğu işə peşman olmuşdu. O, az qala ağlayacaqdı. Anasının verdiyi gül dəstəsini stolun üstünə qoydu. Bayaqdan bəri sol əlində tutduğu qızılgül dəstəsi birdən yerə düşdü.

Gülər əyilib səhərdən bəri axtardığı qızılgül dəstəsini götürdü. Qızılgül dəstəsi solmuşdu. O, indi hər şeyi başa düşdü. Amma heç kimə bir söz açıb deməd. Elxan yaman pərt olmuşdu.

*Hacıağa Cümşüdlü*



## ATA

Ata bina ucaldandı,
Ata ağac əkəndi.
Evdə evin, işdə işin
Qayğısını çəkəndi.

Gör bu sözün hikmətinə
Adam necə inanır.
Ata əli dəyən evin
Ocağı da gur yanır.

Min illərlə bundan əvvəl
Qorqud ata deyəni
İndi hamı əzbərləyir,
İndi hamı bəyənir.

Yetkin olaq, hazır olaq
Ana yurdun əmrinə.
Ömrümüzlə işıq salaq
Ataların ömrünə.

Qoy ürəkdən can yandıraq,
Könül verək hər işə.
Ataların mərd adına
Layiq olaq həmişə!

*Musa Ələkbərli*

## QOCA BƏNNA

Budur, daşları yonub
Ev tikir qoca bənna.
Gündən-günə yüksəlir,
Ucalır göyə bina.
Öz işində çalışır
Qoca gənc bir ürəklə,
Səadət qazanıbdı
O, şərəfli əməklə.
Bir çox binalar tikib
Bizim doğma şəhərdə,
Gəzir onun söhbəti
Ağızlarda, dillərdə.

*Mehdi Seyidzadə*



## SƏMİRƏ VƏ SARIÇİÇƏK

Səmirə ləklərdəki sarıçiçəkləri açmış görəndə sevincindən bilmədi neyləsin:

– Nənə, ay nənə, – dedi, – bir bax! Gör nə qədər çiçək var.

Sarıçiçəyə yaxın gəldi. Qırmaq istədi. Ancaq tikanları əlinə batdı. Ufuldaya-ufuldaya əlini çəkdi. Şikayətləndi:

– Nənə, ay nənə, bu necə güldür? Tikanları əlimi yaraladı...

Nənəsi gülümsədi:

– Bala, o gül deyil, sarıçiçəkdir, – dedi.

– Sarıçiçək?! Nə olsun ki? Tikanlı gülü də həyətdə əkərlər? Nənə, pis güldür bu, pis güldür!

– Pis?! – Bu dəfə nənəsi etirazını bildirdi. – Bu pis gül deyil, qızım. Bu pis dediyin gülün qırmızıya, sarıya çalan çiçəklərini yığıb quruduruq, plova, zirətova, başqa xörəklərə vururuq. Bu heç sarıkökdən geri qalan deyil... Bax, bu gün daşda döyəcəyim küftəyə də sarıçiçək vuracağam. Bir bax, bala.

Nənəsi iri ət daşını, toxmağı gətirdi. Yumşaq ət parçalarını daşın üstünə qoydu, toxmaqla döyəclədi. Döyülmüş ətə mərzə, nanə, şüyüd vurdu, yumrulayıb soyuq su tökülmüş qazana saldı. Qazana sarıçiçək də atmağı unutmadı. Sonra onu qaz pilətəsinin üstünə qoydu.

– Hə, bala, – dedi, – bax, əsl küftə belə hazırlanır. Bircə burum qaynayan kimi ətri aləmə yayılacaq.

Bir azdan küftənin ətri mətbəxi bürüdü. Sonra həyətbacaya yayıldı.

Bu ətir Səmirəni yamanca iştaha gətirdi. Ağzı lap sulandı. Amma nənəsinə heç nə demədi. Birdən nənəsi ayrı şey düşünərdi onun haqqında.

Nənəsi deyəsən Səmirənin ürəyindən keçənləri oxudu:

– Hə, görürəm xoşuna gəlir. Bir azdan şam edəcəyik, – dedi. Söhbəti yenə sarıçiçəyin üstünə gətirdi: – Küftənin belə yaxşı çıxması sarıçiçəkdəndir. Sənin əllərinə tikanı batan o çiçəkdən.

Səmirə indi bildi ki, nənəsi sarıçiçəyi – tikanlı çiçəyi nahaqca həyətdə əkməyib.

*Bayram İsgəndərov*

## ÇƏMƏN

Bizim bağçamıza
Bir çəmən düşüb,
Sürüşüb baharın
Çiynindən düşüb.
Gündüzlər nə qədər
Quzu var orda,
Xırpaxırp otlayır
Quzular orda.
Səhərlər orada
Şeh var, inci var,
Şehlər quzuların
Gözütək parlar.

Düzü, başdan-başa
Tərifdir çəmən,
Quzu tükü kimi
Zərifdir çəmən.
Gəlin, siz də görün
Çəmənzarımı,
Amma ürkütməyin
Quzularımı.
Bizim bağçamıza
Bir çəmən düşüb,
Sürüşüb baharın
Çiynindən düşüb.

*Zahid Xəlil*

## USTA-ŞAGİRD

Bakı payızının soyuq günlərindən biri idi. Mən buruqların arasında gəzib-dolanır, neft çıxaran mancanaqlara, içindən neft axan borulara baxırdım. Bu vaxt neft buruqlarının arasında görünən bir günbəz diqqətimi cəlb etdi. Məni fikir götürdü. Köhnə fəhlə mənzillərinin yerində uca binalar tikilmiş, yanğınlar törədən taxta buruqların yerində polad buruqlar qurulmuşdu. Hər şey, hər şey dəyişmişdi. Bəs niyə köhnə günbəz toxunulmamış qalmışdı?!

Yaxına gəlib günbəzə maraqla tamaşa etdim. Elə bu zaman mənə tərəf buxara papaqlı, qalın qaşlı, eşmə bığlı bir kişinin gəldiyini gördüm. Biz salamlaşıb, tanış olduq. O, yazıçı olduğumu, mən də onun qocaman neftçi olduğunu öyrəndim.

– Bu günbəzin adı nədir? – deyə mən ustadan soruşdum.

– "Usta-şagird".

– Nə üçün "Usta-şagird?"

– Onun maraqlı bir tarixi var, – deyə qoca neftçi günbəzin əfsanəsini danışmağa başladı:

– Deyirlər ki, burada məşhur usta, bir də onun ağıllı şagirdi yaşayırmış. İllər keçir, şagird sənətin sirlərini dərindən öyrənir, öz ustasını ötüb keçir. Onlar bəhsə girirlər – "Görək kim daha yaxşı bir günbəz tikər", – deyə mərc gəlirlər. Hər ikisi yeddi il gecə-gündüz dincəlmədən çalışır. Hərə öz günbəzinə bir naxış vurur. İş başa çatanda el-oba axışıb tamaşaya gəlir. Göyə ucalan iki gözəl günbəzə baxırlar. Camaatın yarısı usta tikən günbəzi bəyənir, o biri yarısı isə şagirdin günbəzinin daha gözəl olduğunu söyləyir.

Mən kişinin sözünü kəsib xəbər aldım:

– Bəs ikinci günbəz hanı?

– O çoxdan uçmuşdur!

– Bəs bu salamat qalan günbəz kimindir?

– Şagirdin! – deyə qoca neftçi əlini yuxarı qaldırdı, naxışlı daşları bir-birinə geydirilən günbəzin yaraşıqlı qülləsini göstərdi: – Gör necə yaxşı qalıb. Elə bil ki, dünən tikilib!

– Demək zamanın sınaqlarından şagird qalib çıxıb?

– Bəli, şagird, dərs aldığı üstasını ötüb-keçib!



– İndi onların hansını ustad hesab etmək olar?

– Əlbəttə, ustanın zəhmətini itirməyən, qədir-qiymətini bilən şagirdi ustad hesab etmək olar!

Mən böyük sənətkarın xatirəsinə hörmətlə papağımı götürdüm, başımı ehtiramla əyib qoca neftçinin sözünü təsdiq etdim:

– Kimin qoyduğu abidə daha uzun ömür sürürsə, əsl ustad odur!

*Süleyman Rəhimov*

## İPƏKQURDU

Vüqar Bakıda anadan olmuşdu. Babası məktub yazırdı ki, Vüqarı da götürüb kəndə gəlin. Nəhayət, onlar kəndə getməli oldular.

Kənddə babanın gözəl həyəti, bağı vardı.

Bir gün baba ilə nəvə qarğıdan hörülmüş daxmaya gəldilər. Buğum-buğum qurdlar qıvrılıb açılır, başlarını sağa-sola döndərirdi. Vüqar təəccüblə soruşdu:

– Baba, bu nədir?

– İpəkqurdu. Onlar barama sarıyırlar.

– Barama nəyə lazımdır, baba?

Baba gülümsəyib dedi:

– İpək parça toxumaq üçün.

– Bəs niyə onlar belə qıvrılıb açılırlar?

– Acdırlar, oğlum, yarpaqları qurtarıb.

Vüqar sevincək dedi:

– Baba, həyətdə bir qədər yarpaq var.

Qırıb gətirim, yesinlər.

Baba nəvəsini qucaqlayıb dedi:

– Oğlum, ipəkqurdu hər ağacın yarpağını yesəydi, dərdimiz nəydi? Onlara ancaq tut yarpağı lazımdır. İpəkqurdunu bəsləyib, yedirtmək üçün çoxlu tut ağacı əkirik. Sonra yarpaqla dolu budaqlarını kəsib onlara veririk. Ağaclar yenidən qol-budaq atır, yarpaqlayır. Biz yenə də onu kəsib qurda yediririk ki, onlar bizə bollu-bollu ipək versin.

*Əlfi Qasımov*

**YEDDİ ÇİNAR**

Yeddi çinar, yeddi çinar –
Yeddi meydan, yaşıl çadır.
Yarpaqları ləçək-ləçək,
Budaqları göyə çatır!

Əsmə, külək, əsmə, külək!
Bir-birinə dəyib sınar
Zümrüd kimi o yarpaqlar,
Çılpaq qalar yeddi çinar!

Qalxıb pöhrə budaqları,
Pıçıldaşır yarpaqları.
Doğma, əziz torpaqları
Kölgəsiylə qucaqlayır
Yeddi çadır, yeddi çinar!

Kim yetirib sizi belə!
Alnından tər silə-silə,
Aydan-aya, ildən-ilə;
Keçirsiniz qatar-qatar,
Yeddi çadır, yeddi çinar!

Əsmə, külək, əsmə, külək!
Bir-birinə dəyib sınar
Zümrüd kimi o yarpaqlar,
Çılpaq qalar yeddi çinar.

*Rəsul Rza*







# BƏXTƏVƏR UŞAQLAR



ÖZÜNÜ İTİRMƏDİ

Sevda məktəbdən gələndə saat on iki idi. Anası qızına yemək verib bazara getdi. O, qapıdan çıxan kimi Sevda tez mətbəxdəki stolun üstünə qəzet açdı. Sonra "Ana dili" kitabını vərəqlədi. Meyvə şəkli çəkilmiş səhifəni tapdı. Qırmızı plastilindən qoparıb ovcunda əzişdirdi. Qız gözünü kitabdakı nar şəklindən çəkmirdi. Elə bu vaxt telefonun səsi eşidildi. Sevda qaçıb yataq otağına girəndə çaşdı, telefon da yadından çıxdı. Evin küncündən şırhaşırla su axırdı. Qız tez hamamdan vedrə, əsgi gətirdi. Vedrəni axan suyun altına qoydu, döşəmədəki suyu əsgi ilə yığıb, vedrəyə sıxmağa başladı. Lakin otağı qızdıran buxar batareyasından axan su ara vermirdi. Bunu görən Sevda əvvəl özünü itirdi. Sonra tez həyət balkonuna çıxıb yoldaşlarını səslədi:

– Lalə, İradə, Rəfiqə, tez bizə gəlin, evimizi su basır.

Sevda mənzillərinin qapısını açanda qızların üçü də özlərini təngnəfəs içəri saldı. Sevda borunun deşiyinə əsgi təpir, heç bir dəqiqə keçmirdi ki, islanıb ağırlaşmış əsgi şappıltı ilə yerə düşürdü. Qızlar əllərinə keçən əsgi ilə parket döşəmənin suyunu yığırdılar. Su isə getdikcə çoxalırdı. Taxta çarpayıların, paltar şkafının, yazı stolunun



ayaqları su içində idi. Sevda qaçıb qonşularını çağırdı. Əsmər nənə Sevdanın təpədən-dırnağa qədər su içində olduğunu görüb təəccüblə soruşdu:

– Ay qızım, bu nədir, soyuqlayarsan ki!?

– Əsmər nənə, tez bizə gəlin!

İradənin nənəsi, borudan şırıltı ilə fışqıran suyu görüb qorxuya düşdü.

– Tez olun, suyu yığın, yoxsa ikinci mərtəbəyə, Lalə-gilin evinə damar.

Əsmər nənə Sevdanın qolundan tutub, eyvana çıxartdı. Həyətin sol tərəfindəki alçaq binanı ona göstərib dedi:

– Bax, ora ocaqxanadır, sən hamıdan cəldsən, tez qaç, xəbər ver. Qoy suyu bağlasınlar, yoxsa aləmi isladacaq.

Sevda üst-başı su içində ocaqçının yanına qaçdı. Qız qayıdıb evə gələndə su artıq kəsilmişdi. Lalə, İradə və Rəfiqə tələsə-tələsə döşəmənin suyunu yığırdılar. Sevdanın dalınca ocaqçı Vasif dayı içəri girdi. Qoca borunun deşiyini bağlayıb getdi.

Sevda suyun tamamilə kəsildiyini görüb çox sevindi və rəfiqələrindən soruşdu:

– Ay qızlar, heç ocaqxanada olmusunuz?

Qızlar bir-birinə baxıb çiyinlərini qısdılar. Sevda gülə-gülə dedi:

– Elə bil zavoddur. Çoxlu maşın var. Gupultudan ağız deyəni qulaq eşitmir. Mən hey qışqırırdım ki, su axır, Vasif dayı səsimi eşitmirdi. Axırda əyilib qulağını ağzıma yaxınlaşdırdı.

İradənin nənəsi isə yerin suyunu yığırdı. Sevda tez bir əsgi götürüb, parketi qurulamağa başladı. O, həm iş görür, həm də söhbət edirdi:

– Qızlar, qorxuram parketimiz xarab ola. Tez-tez silək, çox yaş qalmasın. Anam deyir ki, su parketi qaraldır.

Qapının zəngi çalındı. Sevda tez qaçıb qapını açdı. Gələn anası Validə idi, qızının su içində olduğunu görüb təəccüblə soruşdu:

– Bu nə üst-başdır, yenə nə dəcəllik etmisən?

Sevda batareyadan su axmasını, qaçıb ocaqçıya xəbər vermәsini tələsik anasına danışdı.

Ana alt mərtəbədə olan qonşunun qızı Lalədən soruşdu:

– Sizə su dammayıb ki?

– Xeyr, Validə xala, bir damcı da düşməyib, narahat olmayın.

Validə xala Sevdaya quru paltar geyindirə-geyindirə dedi:

– Əsmər bacı, çox sağ olun, qonşuluqdan əskik olmayasınız.

Əsmər nənə Sevdanı qucaqlayıb başını tumarladı:

– "Sağ ol" sözünü mənə yox, bax bu qızına de. Çox qoçaq qızdır.

*Xalidə Hasilova*

## ƏLLƏRİMDƏ NƏLƏR VAR

Əllərimin içində
Gör nələr var, yaxşı bax.
Uçur xallı kəpənək,
Çiçək açır bağça-bağ.

Əllərimdə çaylar var.
Dənizlər var, göllər var.
Üstü şehli güllər var,
Göyərçinli göylər var.

Əllərimin içində
Bir bax, neçə bina var.
Bura sığar küçələr,
Uca, gözəl binalar.

Əllərimin içində
Neçə dosta salam var.
İnsanları oxşayar,
İnsanları salamlar.

Əllərimin içində
İsti çörək ətri var.
Neçə mahnı notu var,
Neçə şerin sətri var.

*Məmməd Namaz*



## YELLƏNCƏK

Qonşu həyətin uşaq meydançasında yerə yoğun dirəklər basdırdılar, yuxarıdakı köndələn dəmirdən sallanan millərdən oturacaq asdılar, hamısını ağ-qırmızı rənglədilər. Yelləncək hazır oldu.

Jalə atasıyla qonşu həyətdən keçirdi, gördü uşaqlar yelləncəyin başına yığılıb.

– Atacan, gedək, mən də yelləncəkdə yellənim.

– İndi vaxtım yoxdu, Jalə, vaxtım olanda gedərik.

Aradan bir neçə gün keçdi, axır ki, atası Jaləni yelləməyə apardı. Bir oğlan yelləncəkdə oturmuşdu, atası onu yelləndirirdi, bir qız da kənarda durmuşdu, gözləyirdi. Jalәgil də gözləməyə başladılar. Oğlan yellənib qurtardı, düşdü, onu gözləyən qız mindi, anası onu yelləməyə başladı. Jalə qızın düşməsini gözləyirdi, darıxırdı, qız isə oturacaqda rahat-rahat oturmuşdu, yellənirdi. Jaləyə elə gəlirdi ki, qız çox, lap çox yelləndi, amma əslində qız bir az yellənib düşdü. Atası Jaləni yelləncəyə mindirdi, tapşırdı ki, Jalə yelləncəyin millərindən bərk-bərk tutsun ki, yıxılmasın, sonra yelləncəyi yüngülcə itələdi. Yelləncək yavaşca tərpəndi, Jalənin atasından uzaqlaşdı, qayıtdı, atası bir də itələdi, yelləncək bir də getdi-qayıtdı, atası bir də, bu dəfə bir qədər bərk itələdi, yelləncək bir qədər də çox getdi-qayıtdı. Jalə yelləncəkdə oturmuşdu, onunla birgə gedirdi, qayıdırdı. Atası get-gedə yelləncəyi daha bərk itələyirdi, yelləncək də Jaləni daha uzağa aparıb-gətirirdi, daha hündürə qaldırıb-endirirdi. Yelləncək yüksəyə çatıb aşağı gedəndə Jalənin ürəyi düşürdü, tuppuldayırdı. Külək Jalənin saçlarını oynadırdı, gah geri atırdı, gah üzünə dağıdırdı, onda Jalənin gözləri saçlarının arasından parıldayırdı. Atası yelləncəyi get-gedə daha bərk itələyirdi, yelləncək də Jaləni lap yüksəyə qaldırırdı, o elə bil uçurdu. Sevincindən Jalə çığırmağa başladı, sonra elə çığıra-çığıra mahnı oxumağa başladı.



Jalə çoxluca yelləndi. Yellənməyə təzə gəlmiş uşaqlar onun düşməyini gözləyirdilər. Atası Jaləyə dedi:

– Jalə, daha bəsdi, düş.

– Yox, bəs deyil, bir az da yellənim.

Atası onu bir az da yellədi. Uşaqlar Jalənin düşməyini gözləyirdi, hamısı gözlərini yelləncəyə dikmişdi.

Atası dedi:

– Hə, indi bəsdi, düş.

– Bəs deyil, atacan, bir az da yellənim.

Atası daha Jaləni yelləndirmirdi, yelləncək öz-özünə gəlib-gedirdi, get-gedə yavaşıyırdı.

– Jalə, düş, uşaqlar da yellənmək istəyir.

– Yox, mən yellənmək istəyirəm.

Atası Jalənin sözünə baxmadı, onu düşürdü. Jalə düşmək istəmirdi, ağladı, çığırdı. Jalə belə kürlük eləyəndə atası həmişə onunla soyuq danışardı:

– Jalə, belə olmaz. Sən yelləndin, indi qoy başqa uşaqlar da yellənsin.

Jalə ağlaya-ağlaya çığırırdı:

– Yox, mən yellənəcəm, mən!

Atası onu elə ağlaya-ağlaya evə apardı.

Bir neçə gündən sonra yenə Jalə atasıyla yellənməyə gəldi. Yelləncəkdə bir oğlan yellənirdi. Jalə ona baxa-baxa gözləməyə başladı. Oğlan beş dəqiqə yelləndi, on dəqiqə yelləndi, on beş dəqiqə yelləndi. Jalə darıxmağa başladı. Oğlan elə yellənməyində idi, anası da bir söz demirdi. Jaləgilin gəlməyindən iyirmi dəqiqə keçirdi, oğlan isə hələ də yellənirdi. Oğlanın anası yelləncəyi itələməkdən yorulmuşdu, ona görə dedi:

– Daha bəsdi, düş.

– Yox, yellənmək istəyirəm.

Jalə də, təzəcə gəlmiş uşaqlar da gözləyirdilər, ayaqlarının birini götürüb, birini qoyurdular, amma oğlan düşmədi ki, düşmədi. Oğlan ərköyün uşağa oxşayırdı, anası ona "yox" demək istəmirdi. Uşaqlar yenə gözləyə-gözləyə qaldılar. Jalə dözmədi, dedi:

– Ay oğlan, düş də!

Oğlan düşmədi ki, düşmədi.

– Ay oğlan, düş, biz də yellənək də!

Oğlan düşmədi, nəinki düşmədi, hələ bir qışqırmağa da başladı:

– Yelləncək mənimdi, mən yellənəcəm!

Oğlanın anası yorulmuşdu, daha onun çığır-bağırına fikir vermədi, yelləncəkdən düşürüb ağlaya-ağlaya apardı.

Yelləncəyə Jalə mindi. Atası Jaləni yelləndirməyə başlamazdan əvvəl dedi:

– Jalə, indi bildin, niyə bir az yellənib düşmək lazımdır?

– Bildim, atacan, bildim...

Axı Jalə ağıllı qız idi...

*Çingiz Sultanov*

## HEÇ ÖZÜ DƏ BİLMİR...

Polad mehriban oğlandır. Həmişə üzü gülür. Hörmətcildir. Qoca adam görəndə kömək edir. Yoldan keçirir, zənbilini aparır. Ağaclara, yaşıllığa barmağının ucu ilə də dəymir. Məktəbə apardığı çörəyi çox vaxt özü yemir. İtə, pişiyə, quşlara verir. Amma... nədənsə hamı ona səliqəsiz deyir. Siniflərindəki Sevda onu "pinti Polad" deyə çağırır. Düzü, heç Poladın özü bilmir niyə... Səhər dərsə gedəndə anası şalvarını ütüləyir, ağappaq köynək geyindirir, telini darayır. Axşam isə qapını açanda ürəyini tutub oturur. Gücü bircə dəfə "Bu nə üst-başdır?" deməyə çatır. Polad da hər dəfə gözucu dəhlizdən asılmış aynaya baxır. Şalvarını dizəcən palçığa bulanmış görür. Köynəyini tanımır. O qədər əzik, ala-bula olur ki... Üz-gözündən toz tökülür.

Bu dəfə də elə oldu. Ayaqqabılarından su süzülə-süzülə içəri girəndə anası heç onun üzünə baxmadı. Salamını da almadı! Təkcə soruşdu:

– Yenə nə oyun çıxarmısan?

– Heç nə...

Amma Polad yalan danışa bilmirdi. Doğru söz deməyəndə başını aşağı salar, alnına tökülən telini tez-tez barmağıyla yana darayardı. Anası da o dəqiqə hər şeyi başa düşərdi.

– Düzünü de görüm!

– Heç nə... Məktəbimizin həyətində qəşəng bir gölməçə var!

Polad bunu deyib duruxdu. Bildi ki, gölməçəni tərifləməkdə düz hərəkət eləmədi. Bu, anasını daha da acıqlandırar. Ona görə səhvi düzəltməyə tələsdi:

– Yox e... bu gölməçə yağışdan sonra qalıb. Dərin deyil! Mənim buramdandır... – Polad əyilib ayaqqabısının üzünü göstərdi. – İdman zalında yarışma vardı. Mən də Vaqifə dedim ki, gəl biz də balacaların birinciliyini keçirək. Gölməçənin içində bir ayağı üstə dayanaq. Kim çox dursa, o da qalib gələcək!.. Mən çox dayandım...





Anası incik halda dilləndi:

– Belə de...

Poladın ürəyi düşdü. Axı o, anasını incitmək istəmirdi... Elə bilirsiniz bunları bilə-bilə edir? Yox... Bu işlər onun başına birdən-birə gəlir, heç özü də istəmədən...

... Bax, dünən növbətçi idi. Böyük tənəffüsdə hamı sinifdən çıxdı. O da yazı taxtasını yarıya qədər nəm əsgi ilə sildi. Sonra... Sonra nə fikirləşdisə təbaşirlə şalvarına, pencəyinə ay, ulduz şəkilləri çəkdi. Uşaqlar sinfə girəndə qışqırdı:

– Mən kosmosam! Mən kosmosam!

Bunun üstündə müəllim dərsdən sonra onu sinifdə saxladı. Şotka verib üstünü təmizlətdi. Gündəliyinə də qırmızı mürəkkəblə çoxlu söz yazdı. Buna görə Polad aldığı dördlə beşi anasına göstərməyib.

O gün isə...

Belə günlər o qədərdir ki... Hansını deyəsən?! Hər dəfə Polad söz verir ki, daha belə işlər tutmasın... Amma özü ilə bacara bilmir...

*Fuad Tarverdiyev*

## VELOSİPED

Nərmin çoxdan velosiped istəyirdi. Hər gün atasına deyirdi:

– Atacan, mənə velosiped al.

– Alaram, Nərmin, alaram.

Bir dəfə axşam evə gələndə atası əlində velosiped gətirdi. Velosiped qəşəng idi, üçtəkərli idi, qırmızı idi. Nərmin sevincindən atıldı-düşdü, atasının dizlərini qucaqladı, yanağından öpdü. Sonra velosiped sürmək üçün həyətə düşdü. Həyətdə hələ heç kimin velosipedi yox idi, ona görə uşaqlar Nərminin başına yığıldılar. Xavər soruşdu:

– Nərmin, velosipedi mənə verərsən?

Əkrəm dedi:

– Nərmin, Nərmin, ona yox, mənə ver.

– Yox, heç kimə verməyəcəyəm, özüm sürəcəyəm.

Nərmin velosipedi heç kimə vermədi, özü sürdü. Uşaqlar ona baxa-baxa qaldılar. Sabahı gün də Nərmin velosipedi özü sürdü. Daha ondan velosiped istəyən olmadı. O biri gün Nərmin velosipedini yenə tək sürürdü. Bu vaxt gördü həyətin bir tərəfində uşaqlar top-top oynayırlar. Nərmin velosipeddən düşdü, qoşuldu uşaqlara, top-top oynamağa başladı.

Xanım dedi:

– Nərmin, bax, Ceyhun sənin velosipedinə mindi.

Nərmin dedi:

– Nolar, qoy minsin. Mən xəbərçiləri xoşlamıram.

Əkrəm tez qışqırdı:

– Nərmin, Nərmin, Ceyhundan sonra mən sürərəm, olar?

– Olar.

Tərlan dedi:

– Nərmin, Əkrəmdən sonra da mən.

– Yaxşı.

Doğrudan da tək velosiped sürməyin nə ləzzəti?

*Çingiz Sultanov*



## ALMAZIN XƏSTƏLƏNMƏSİ ƏHVALATI

Günlərin bir günündə Almazın anası paltar yumağa hazırlaşırdı. Pal-paltarı tökmüşdü ortaya, çəndə ılıq su hazırlayırdı. Anası bir iş görəndə Almaz həmişə gəlib yanında durardı, anasını yamsılayardı. Anası xörək bişirsəydi, Almaz qab-qacağını, dəhrə-bıçağını ortaya tökərdi, kuklalar üçün qazan asardı. Anası tikiş tiksəydi, Almaz da barmağına üskük taxıb iynə-sap götürərdi. Odur ki, Almaz anasının paltar yumağa hazırlaşdığını görüb dedi:

– Anacan, mən də paltar yumaq istəyirəm.

Anası dedi:

– Almaz, bu gün paltar yuma.

– Niyə, anacan?

– Hava soyuqdu, yuma. Əynin-başın islanar, soyuqlayarsan.

– Yox, anacan, elə yuyaram, islanmaz.

– Yox, Almaz, ayrı vaxt yuyarsan.

Nə isə anası çox dedi, Almaz az eşitdi, dediyinin üstündə durub paltar yumağa girişdi. Tas-tabaq götürdü, kuklalarının çirkli tuman-köynəyini ləyənə doldurdu, üstünə su töküb ovxalamağa başladı. Ovxaladı, elə qızışdı ki, üst-başı ləyəndəki paltarlardan betər yaş oldu. Anasının başı işə qarışmışdı, bir də ayılıb gördü ki, Almaz tamam su içindədi, dedi:

– Ay Almaz, dedim axı sənə, paltar yuma, yaş olacaqsan bu soyuq havada!

Anası tez Almazın paltarını, corablarını dəyişdi, amma gec idi, bir azdan Almaz asqırmağa başladı. Sabahı gün Almaz yuxudan tutqun durdu, ağlamsınırdı, canı ağrıyırdı, qızdırması qalxmışdı. Almazın xəstələnməsi belə oldu.

*Çingiz Sultanov*

## GÜNAH MƏSTANDA İMİŞ

İstirahət günü idi. Həyət-bacanı pambıq kimi ağ qar basmışdı. Günün işığında qar ulduz kimi parıldayırdı.

Şamil burnunu pəncərənin şüşəsinə dayayıb həyətdə top-top oynayan uşaqlara tamaşa edirdi. Odur, uşaqlardan

biri böyrü üstə yumşaq qarın içinə yıxıldı. Qalanları da onu dövrəyə alıb gülüşdülər. Şamil nə qədər yalvardısa onu həyətə buraxmadılar. O, dodaqaltı mızıldandı:

– Axı, bu qaloşu kim çıxarıb? Bəyəm qaloşsuz qarın üstündə oynamaq olmaz?!

... Səhər ertə, uşaqlarla birlikdə həyətə çıxmaq istəyəndə bir də gördü ki, qaloşunun bir tayı yoxdur. Nə qədər axtardısa, tapa bilmədi. Paltosunu, papağını geyindi, qapıdan çıxanda, anası mətbəxdən çığırdı:

– Şamil, bir bəri gəl, hara qaçırsan?

– Həyətə. Hamı həyətdədir. Uşaqlar məni gözləyirlər.

– Oğlum, möhkəm geyin. şərfini da boğazına sarı, soyuq dəyər.

Şamil qayıdıb şərfini boynuna sarıdı. Elə qapıdan çıxmaq istəyirdi ki, Firəngiz çığırdı:

– Şamil, qaloşlarını da gey!

Şamil onun sözünə fikir vermədi. Bunu görən Firəngiz ucadan dedi:

– Ana, ay ana, Şamil qaloşlarını geyməyib.

Ana əllərini çiynindəki dəsmalla silə-silə mətbəxdən çıxdı.

– Ay bala, axı mən sənə dedim ki, möhkəm geyin, yoxsa buraxmaram.

Bu vaxt Şamilin atası da dəhlizə çıxdı. Şamil qaloşunun tayını axtarmağa başladı. Paltarasanın, şkafın, stolun altına baxdı. Evə keçdi, bütün çarpayıların altını axtardı. Qaloşu elə bil yer udmuşdu. Bir azdan gün batdı, sulu qar yağmağa başladı. Uşaqlar da dağılışıb evlərinə getdilər.

Günorta Şamilin anası xörək çəkirdi. Hamı stolun ətrafına yığışmışdı. Məstan ət iyinə taxtın altından çıxdı. O miyoldaya-miyoldaya Firəngizə tərəf gəldi. Şamil Məstana baxdı. Birdən qaloşu taxtın altında gördü. Demə, Məstan qaloşun üstündə yatıbmış. Şamil qəzəblə Məstanı hədələdi:

– Yaxşı, Məstan, əlimə düşərsən!

Məstan da elə bil təqsiri olduğunu başa düşmüşdü. O, cəld Firəngizin qucağına atıldı. Başını qısıb, gözlərini yumdu.

*Ələviyyə Babayeva*



## HANSI ASANDIR?

Üç oğlan bir-birinə qoşulub meşəyə getdi. Meşədə nə yoxdu? Göbələk, meyvə, quşlar... Uşaqların başı qarışdı, heç özləri də bilmirdilər ki, gün necə gəlib keçdi. Qayıdanda qorxurdular:

– Evdə acıqlanacaqlar!

Onlar yolda dayanıb fikirləşdilər: görəsən, yalandan bir şey uydurub desək yaxşıdır, ya düzünü söyləsək?

Oğlanlardan biri dilləndi:

– Mən deyəcəyəm ki, meşədə üstümə qurd düşdü. Atam qorxar, daha məni danlamaz.

İkincisi dedi:

– Mən deyəcəyəm ki, babama rast gəldim. Anam sevindiyindən mənə dinməz.

Üçüncü oğlan isə dedi:

– Ancaq mən düzünü söyləyəcəyəm. Düzünü demək daha asandır. Yalan niyə deyim?

Uşaqlar evlərinə dağılışdılar. Birinci oğlan atasına qurd əhvalatını demiş oldu. Bir də gördü ki, meşə gözətçisi gəlir. O dedi:

– Yox, bu yerlərdə qurd olmur.

Oğlanın atası hirsləndi. Oğlu gec gəldiyi bəs deyil, hələ bir yalan da danışırdı.

İkinci oğlan babası haqqında demiş oldu: sən demə, babası onlara qonaq gəlibmiş.

Oğlanın anası hirsləndi. Oğlu gec gəldiyi bəs deyil, hələ bir yalan da danışırdı.

Üçüncü oğlan isə içəri girən kimi, hələ kandarda təqsirini boynuna aldı. Xalası onu danladı, ancaq bir az sonra günahından keçdi.

*Valentina Oseyeva*



## İNTİQAM ALDI

Katya öz stoluna yaxınlaşdı. Gözləri bərəldi: yeşik açılmışdı. Onun təzə rəngləri pərakəndə dağılmış, fırçaları bulaşmışdı. Stolun üstündə bulanıq su gölməçələri vardı.

– Alyoşka! Alyoşka! – deyə Katya çığırdı, əllərilə üzünü örtüb bərkdən ağladı.

Alyoşanın yumru başı qapının arasından göründü. Onun yanaqları və burnu rəngə bulaşmışdı.

O, cəld dilləndi:

– Mən ki sənə bir şey eləməmişəm.

Katya yumruğunu düyünləyib qardaşının dalınca qaçdı. Ancaq Alyoşa qapının dalında görünməz oldu və açıq pəncərədən bağa atıldı.

Katya ağlaya-ağlaya çığırdı:

– Əvəzini çıxacağam.

Alyoşa meymun kimi ağaca dırmaşdı. Aşağı budaqların birindən yapışıb bacısına acıq verməyə başladı:

– Eh ağlağan, bir rəngdən ötrü ağladı!

– Di yaxşı, mən səni elə ağladım ki, – deyə Katya çığırdı, – elə ağladım ki!



– Eh, kimi, məni ağladacaqsan? – deyə Alyoşa güldü və tələsə-tələsə yuxarı budaqlara dırmaşmağa başladı.

– Sən hələ bir gör məni tuta bilirsən?

Birdən onun ayağı sürüşdü, yıxılmamaq üçün nazik bir budaqdan yapışdı. Budaq şaqqıltı ilə sındı, Alyoşa yıxıldı.

Katya qaçıb özünü bağa saldı. O saat öz korlanmış rəngləri və qardaşı ilə aralarında olan dalaşma yadından çıxdı.

– Alyoşa, Alyoşa! – deyə o çığırırdı.

Qardaşı yerdə oturub əllərilə başını tutmuş, qorxaq nəzərlərlə bacısına baxırdı.

– Dur ayağa, ayağa dur.

Alyoşa isə başını çiyinləri arasına qısıb gözlərini də yumdu.

– Dura bilmirsən? Yapış məndən, – deyə Katya Alyoşanın dizlərini qorxa-qorxa yoxlamağa başladı.

Qız qardaşının çiyinlərini qucaqlayıb onu asta-asta ayağa qaldırdı.

– Ağrıyırmı?

Alyoşa başını yırğaladı, birdən ağladı:

– Nə oldu? Ayaq üstə dura bilmirsən? – deyə Katya soruşdu.

Alyoşa bacısına qısılıb daha da bərkdən ağladı.

– Bir də sənin rənglərinə toxunmaram... Heç vaxt... Heç vaxt dəymərəm!

*Valentina Oseyeva*

## XATİRƏ

Birinci sinfin dərsləri qurtarmışdı. Uşaqlar evə gedirdilər. Səhərdən bəri yağan yağış dayanmışdı. Amma hər yer palçıq olmuş, gölməçələr əmələ gəlmişdi. Xatirə, Kəmalə və Mətanət yıxılmamaq üçün əl-ələ tutub gedirdilər. Çantalarını çiyinlərinə aşırmışdılar. Uşaqların səs-küyü eşidilirdi. Birdən boğuq bir şappıltı səsi gəldi. Xatirəgil dönüb geriyə baxdılar. Həsən palçıqlı əlini bir-birinə vurub bərkdən güldü:

– Bir çantana bax, gör necə yaraşıqlıdır. Ona palçıqdan gül vurmuşam!

Qızlar çantalarına baxdılar. Xatirənin çantasına palçıq

yapışmışdı. Mətanət Həsəni hədələdi:
– Yaxşı, müəllimə deyəcəyəm. Qoy səni o günkü kimi danlasın.
Xatirə çantasına baxıb yenə də susurdu.
Kəmalə də dilləndi:
– Niyə dayanmısan, sən də vursana?
Xatirə yavaşça cavab verdi:
– Yox, qızlar, Həsən bilmədi. Adam da bilə-bilə tərtəmiz çantanı bulayarmı?!
Həsənin rəngi allandı. Bir az özünü itirdi. Sonra cəld irəli yüyürdü:
– Hə, Xatirə düz deyir, mən bilmədim, yoxsa... heç belə edərdimmi?!
O, bir vərəq kağız çıxartdı:
– Xatirə, ver silim, qoy çantan təmiz olsun, – dedi.
Xatirə çantanı vermədi:
– Evdə özüm təmizlərəm.
Qızlar yenə söhbət edə-edə getdilər. Həsən də başıaşağı, səssizcə onların dalınca addımlayırdı...

*Əjdər Ağayev*

## MƏN DƏ OYNAMAQ İSTƏYİRƏM

Yayda Nailəgil bağa köçdülər. O, özü ilə bərabər Xallını və Yumrunu da apardı. Yaraşıqlı olsunlar deyə, Yumrunun boynuna çəhrayı lent bağlamışdı. Xallının isə tellərini qırxıb quyruğunda bir balaca qotaz kimi saxlamışdı. Bağda Nailə hara getsə idi, Yumru evdə qalardı. Xallı isə quyruğunu yelləda-yelləyə Nailənin dalınca gedərdi. Bir dəfə uşaqlar gizlənpaç oynayırdılar. Elmira üzünü divara dayayıb, gözlərini yumdu. Uşaqlar isə qaçıb hərəsi bir yerdə gizləndi. Nailə də özünə ən gizli bir yer tapdı. O, təzə təndirə girib gizləndi. Amma Elmira gözünü açan kimi təndirin yanına gəldi, içəri baxdı, qaçıb əlini divara döyə-döyə:
– Gördüm, Nailə! – deyə çığırdı.



Sonra Eldarı, Faiqi, Rüstəmi axtarıb tapdı. Amma axırda Əşrəf gəlib əlini Elmiradan əvvəl divara döyüb:
– Hamının əvəzinə, – deyə çığırdı.
Elmira yenidən divara söykəndi. Nailə fikirləşdi ki, bu dəfə elə yerdə gizlənsin, Elmira onu axşama qədər axtarsa da tapmasın. O gedib üzüm əzilən axurun içində uzandı, üstünə də saman tökdü.
Elmira gözünü açan kimi yüyürüb düz axurun qabağına gəldi. Samanları qaldırdı:
– Nailə, gördüm, – deyib Nailədən əvvəl qaçıb əlini divara döydü. Sonra o bir-bir bütün uşaqları axtardı, amma yenə də Əşrəf gəlib Elmiradan əvvəl əlini divara döydü və:
– Hamının əvəzinə, – deyə çığırdı.
Elmira üçüncü dəfə də gözünü yumdu.
Uşaqlar hərəsi bir yerdə gizləndi. Nailə də gedib əncir ağacına dırmaşdı.
– Hə, indi Elmira lap sabaha qədər də axtarsa məni tapa bilməyəcək, – deyə fikirləşdi. Yerini rahatlamaq istəyirdi ki, birdən Elmiranın səsini eşitdi:
– Nailə gördüm, gördüm, odu, əncir ağacındasan.
Nailəni fikir götürdü:
– Axı bu Elmira nə üçün həmişə məni birinci tapır?!
O, qəmli-qəmli Xallıya baxdı. Xallı qotaza oxşayan quyruğunu o tərəf-bu tərəfə yelləded ərək, təndirin qabağında, axurun yanında olduğu kimi ağacın altında durmuşdu. O, dilini çıxardıb yeyin-yeyin ləhləyirdi. Pəncələrini qaldıraraq, istəkli sahibi Nailənin yanına, ağaca qalxmağa can atırdı. Bunu görən Nailəyə elə bil kim isə dedi:
"Sənin yerini Elmiraya Xallı bildirirdi".
Nailənin Xallıya bərk acığı tutdu:
– Bundan sonra bir də dalımca qaçma, – deyə ona acıqlandı, – bildin?!
Xallı günahkarcasına Nailəyə baxıb zingildədi.
Elə bil o – "Axı mən də oynamaq istəyirəm" deyirdi.

*Həbibə Zeynalova*

## PEŞMANÇILIQ

Tahir anası ilə kəndə, xalasıgilə qonaq gəlmişdi. Kəndin çox gözəl vaxtı idi. Xüsusən yay fəsli olduğundan çiçəklərin ətri, quşların cəh-cəhi adamı heyran edirdi. Ağacların budaqları meyvələrin ağırlığından əyilib az qala yerə dəyirdi.

Kənd həyatı Tahirin çox xoşuna gəlmişdi. O, xalası uşaqları ilə bağda meyvə dərir, çaya çimməyə gedir, rəngbərəng kəpənəklər tuturdu. Tahir uzun bir kəndir tapıb özü üçün yelləncək də qurmuşdu. Hava çox isti olanda o daha çölə gəzməyə getmirdi. Ağacların sərin kölgəsində uşaqlarla yellənirdi.

Bir gün Tahir yelləncəkdə yellənərkən birdən gözləri qonşu həyətdən xalasıgilə tərəf əyilmiş armud ağacı budaqlarına sataşdı. Sapsarı sulu armudlar uzaqdan adamı çağırıb elə bil deyirdi ki, "gəl məni dər!" Tahirin gözü armudlarda qaldı. Xalasıgilin həyətində meyvə çox idi. Amma belə gözəl armud yox idi, Tahir onlardan keçə bilməzdi. Armudlardan bir neçəsini dərmək fikri bir dəqiqə belə onun başından çıxmırdı. O fikirləşirdi ki, indi uşaqlarla armudu daşlasa hay-küy düşəcək, qonşu səsə gəlib əhvalatdan xəbər tutacaqdır. Sonra da kəndin içində Tahirin adı qalacaq "armud oğrusu". Yaxşısı budur ki, bu iş sonraya qalsın.

Həmin günün səhəri Tahir uşaqlardan xəlvət axtarıb bir qarğı tapdı. Onun ucunu haça kimi aralayıb arasına ağac keçirtdi, beləliklə, qarmaq əmələ gəldi. İri armudları burub bir-bir üzmək olardı.

Tahir uşaqlar evdə olmadığı vaxt qarğını götürüb həyətə cumdu. Armudlar o qədər yetişmişdi ki, qarğını burmaq lazım gəlmirdi. Onlar toxunan kimi özləri tappıltı ilə yerə düşürdü.

Tahir qoynunu armudla doldurdu. Evlərinə gəlmək istədikdə darvazanın döyüldüyünü eşitdi.

O, qapıya yaxınlaşıb soruşdu:

– Kimsən?

– Mənəm, bala, qapını aç!



Tahir qapını açdıqda qonşuları Murad babanı gördü. O, əlində içi ağzınacan sapsarı armudlarla dolu bir səbət tutmuşdu.

Murad baba Tahiri görcək dedi:

– Bala, dünən bağdan armud dərmişdim. Dedim, uşaq şəhərdən gəlib, bir az aparım, yesin. Apar ver anana.

Tahir qıpqırmızı qızardı. Qoynundakı armudlar elə bil ki, od olub bədənini yandırdı.

O, qocanın üzünə baxmadan əlini uzadıb səbəti aldı.

Tahir öz hərəkətindən elə peşman olmuşdu, özünü elə itirmişdi ki, qapını örtdükdən sonra tez bir tərəfə çəkilib qoynudakı armudları yerə boşaltdı...

*Şəfiqə Ağayeva*



## TAY ÇƏKMƏ

Atası günorta evə gələndə Tahiri yatmış görüb çox sevindi. Öz-özünə dedi: "Elə yaxşı oldu ki, yatıb, yoxsa dava-dalaş düşəcəkdi".

Sonra qoltuğundakı kağıza bükülmüş balaca qutunu arvadına verib pıçıldadı:

– Rüxsarə üçün almışam, çox qəşəng çəkmədir...

– Bəs Tahirçün? – deyə ana soruşdu.

– Tahirin varıdır, neyləyir?

Ana dinmədi. Çəkmənin o tərəfinə-bu tərəfinə diqqətlə baxıb:

– Doğrudan da gözəl çəkmədir, – dedi.

Sən demə, Tahir yatmayıbmış. O, yorğanın altından qulaqlarını şəkləyib ata ilə ananın söhbətinə qulaq asırdı. Ha istəyirdi ki, yerindən qalxıb desin: "Ata, bəs mənimçün niyə çəkmə almamısan?" Amma dinmədi. Axı anası demişdi ki, əgər gündüz yatmasa, onu kinoya aparmayacaq. Odur ki, Tahir səsini çıxarmadı.

Rüxsarə dərsdən gələndə anası ona atasının aldığı təzə çəkmələri göstərdi. Rüxsarə çəkmələri ayağına geyib bir-iki dəfə evin o baş-bu başına getdi. Doğrudan da narıncı rəngli çəkmələr Rüxsarənin ayaqlarına çox yaraşırdı. Birdən həyətdə oynayan Tahir içəri girdi. Rüxsarənin ayağındakı çəkmələri görcək acıqlı-acıqlı soruşdu:

– Bəs mənimçün almamısan?

– Oğlum, hələ sənin çəkmən var. Gələn il dərsə gedəndə atan sənə bundan da qəşəngini alacaqdır.

Tahir susdu. O, gözlərini həyətdə top-top oynamaqdan burunları ağarmış çəkməsinə zillədi. Xeyli baxdı. Birdən uşaqlar onu səslədilər. Bir söz deməyib çıxıb getdi.

Ertəsi gün evdə belə bir əhvalat baş verdi. Səhər tezdən Tahirin çəkməsinin bir tayı itdi. Ana, ata, Rüxsarə hər yeri axtardılar. Qəribə burasıydı ki, Tahir özü də onlara qoşulub axtarırdı. Gah divanın, çarpayının altına, gah bufetin, pianonun arxasına baxdılar. Çox axtardılar, çəkmənin tayını tapmadılar.

İki gün idi ki, evdəkilər çəkmənin tayını axtarmaqdan təngə gəlmişdilər. Tahirin çəkməsiz qaldığını görən atası Tahirə bir cüt çəkmə aldı. O, atasının aldığı təzə çəkməni bağrına basıb sevincindən atılıb-düşdü. Ayağına geyib xeyli o yan-bu yanına baxdı. Sonra çıxarıb cütlədi, aparıb şkafın içinə qoydu. Tahirin bu işinə ata-anası lap mat qaldı.

Atası soruşdu:

– Oğlum, bəs niyə geymirsən?

Tahir gülümsünə-gülümsünə dedi:

– Ata, köhnə çəkmənin tayını tapmışam.

*Hacıağa Cümşüdlü*





## QIRMIZI ALMALAR

Mənsurə xalagilin həyətində qollu-budaqlı bir alma ağacı var idi. Bu ağac elə qırmızı almalar gətirirdi ki, uzaqdan belə adamın diqqətini çəkirdi. Xüsusən səhərlər, günəş çıxanda almalar daha da allanır, yaşıl yarpaqlar arasında gözəl görünürdü.

Mənsurə xala bir gün balaca oğlu Əlini yanına çağırıb dedi:

– Ay oğul, o almalar daha yetişib, gözlə, qoyma dərib aparsınlar. Xalangil bizə qonaq gələcəklər, onlar üçün saxlayaq.

– Yaxşı, ana, – deyə Əli cavab verdi.

Elə həmin gün necə oldusa Əlinin gözü ağacdakı almalara sataşdı. Bəh, bəh, alma, nə alma! Əli altdan-yuxarı ağaca boylandı. Tamahı düşdü almalara. Necə eləsin? Axı anası tapşırıb ki, onları xalasıgil üçün saxlayır. Külək də vurub salmır ki, götürüb yesin.

Boylandı, boylandı, axırda özünü saxlaya bilməyib çətinliklə ağaca dırmaşdı. Aşağı budağın üstündə qorxa-qorxa, güclə dayanıb almaların irisindən birini dərdi, dişinə çəkib

yedi. Yaman ləzzətli idi. Birini də dərib aşağı düşdü.

O gündən Əli almaya dadandı. Hər gün anası işə gedəndən sonra o, ağacın altına gələr, o yan-bu yana baxar, aranı xəlvət görüncə pişik cəldliyi ilə ağaca çıxar: "Bu özümün, bu Aşurun, bu Əlikramın, bu Fəxrəddinin, bu Orxanın, bu İlhamın, bu Elçinin, bu Ruzbehin..." – deyə yoldaşlarının hərəsi üçün də bir alma dərər, qoynunu doldurub aşağı düşərdi. Sonra birbaş uşaqların yanına qaçıb paylarını verərdi.

Bir dəfə bağı gəzən Mənsurə xala:

– Ay Əli, bu almalar gündən-günə azalır axı, – dedi. – Bunları kim dərir?

Əli dodaqaltı:

– Mən nə bilim, – deyə mızıldandı.

– Bəlkə sən özün...

Əli qaragözlük elədi:

– Mən heç o boyda ağaca çıxa bilərəm? – dedi.

Mənsurə xala daha heç nə söyləməyərək Əlinin ayağı ilə yeri qurdalamağına baxıb işinə getdi.

Üç gündən sonra, ağacda almalar lap azalanda, ana oğlunu yanına çağırıb dedi:

– Əli, kimsə bu ağaca dadanıb, almaları aparır. Belə getsə heç özümüz də nübarını eləməyəcəyik. Daha keçib, çıx o qalan almaları dər, gətir yeyək.

Mənsurənin sözü ağzından qurtarmamış Əli qaçıb ağaca dırmaşmağa başladı. Ayağı yerdən yenicə üzülmüşdü ki, bir də gördü anası gülür:

– Ədə, bəs deyirsən mən ağaca çıxa bilmirəm, hə?

Əlinin əl-qolu boşaldı, sürüşüb yerə düşdü. Nə deyəcəkdi? Öz hərəkəti ilə yalanını çıxartmışdı.

*Əlibala Hacızadə*



## HƏDİYYƏ

Yayda Bəşirin atası xidmət etdiyi hərbi hissə ilə meşəyə, çay sahilində olan mənzərəli düşərgəyə getdi. O, Bəşiri də özü ilə apardı. Bəşir burada Leyla və Yusif adlı iki uşaqla tanış oldu. Bu uşaqlar Bəşirdən yaşca kiçikdilər.

Bəşir və təzə yoldaşları Eyvaz Səfərov adlı bir əsgər ilə bərk dostlaşdılar. Eyvaz uşaqlar üçün qamışdan tütək kəsdi, gildən onlara cürbəcür oyuncaqlar düzəltməyi öyrətdi. Buna görə də uşaqlar Eyvazın xatirini çox istəyirdilər.

Uşaqlar bir dəfə öyrəndilər ki, sabah Eyvazın anadan olan günüdür. Onlar xəlvət bir yerə yığılıb Eyvaza hədiyyə aparmaq barəsində məsləhətləşdilər. Leyla Eyvaza öz kuklasını bağışlamağı təklif etdi. Yusif buna güldü:

– Kukla onun nəyinə gərəkdir, qız deyil ki... – deyə şişmiş qarnını qaşıdı. O, həmişə bir şey xoşuna gəlməyəndə belə edərdi.

Uşaqlar çox fikirləşdilər, ancaq ürəklərinə yatan bir şey tapmadılar. Elə bu vaxt onlar məşqdən qayıdan Eyvazı gördülər. Onun üst-başı toz-palçığa batmışdı. Axı əsgərlər məşq elədikləri zaman yerlə sürünürlər.

– Tapdım, tapdım, – deyə, Leyla qışqırdı. – Gəlin, onun paltarlarını yuyaq.

Yusif də, Bəşir də bununla razılaşdılar. Səhər Eyvaz çadırda yatdığı zaman Bəşir yavaşca gəlib onun paltarını götürdü. O, uzunboğaz çəkməni də götürmək istədi. Birdən yadına düşdü ki, uzunboğaz çəkmələri yumaq olmaz.

Uşaqlar çay qırağına gəlib paltarları yudular. Bəşir gətirib onları yenə də əvvəlki yerinə qoydu. Uşaqlar çadırın böyründə oturub Eyvazın yuxudan ayılıb yuyulmuş paltarları görəndə necə sevinəcəyini gözlədilər. Elə bu vaxt növbətçi əsgər gəlib Eyvazı yuxudan oyatdı və dedi:

– Səfərov, komandir səni çağırır.

Eyvaz paltarlarının yaş olmasına təəccüb etdi. Ancaq çarə yox idi. O, paltarlarını geyib komandirin yanına getdi.

– Bu nə üst-başdır? – deyə komandir hirslə soruşdu. – Çaya yıxılmışdın?

– Özüm də bilmirəm, yoldaş baş leytenant!

– Onda qaupvaxta gedərsən, – deyə komandir əmr etdi.

Kolların dibində gizlənib bu söhbətə qulaq asan uşaqlar dostlarının qaupvaxta düşməsinə çox pərt oldular. Axı qaupvaxta (yəni dustağa) düşmək – kiçik uşaqları küncdə saxlamaq kimi bir şey idi. Bəşir irəli çıxıb dilləndi:

– Ata, ata, Eyvazı qaupvaxta salma. Bunu biz eləmişik.

Bəşirin atası və Eyvaz buna təəccüb etdilər.

– Siz etmisiniz? Nə üçün? – deyə ata ciddi əda ilə soruşdu.

– Bu gün Eyvazın ad günüdür.

– Nə olsun?

Bəşir səbirsizliklə dedi:

– Eh, bilmirsən? Biz hədiyyə eləmək üçün Eyvaz əminin paltarlarını yuduq.

Baş leytenant gülməkdən özünü güclə saxladı. Eyvazın üst-başından su damcılayırdı.

Baş leytenant soruşdu:

– Deməli, bu sizin hədiyyənizdir?

– Hə, hədiyyəmizdir, – deyə uşaqlar fərəhlə cavab verdilər.

Baş leytenant əlini Eyvazın çiyninə qoyub dedi:

– Səni təbrik edirəm. Qaupvaxta getmək əvəzinə axşam bizə qonaq gələrsən.

– Baş üstə, yoldaş baş leytenant!

Bəşirin atası, oğluna və onun dostlarına sarı çevrilib tapşırdı:

– Sizə isə beş gün müddətində çadırın və çayın ətrafında gəzməyi qadağan eləyirəm. Eşidirsinizmi?

Bəşir ağladı, Leyla gözlərini döydü, Yusif isə qarnını qaşıdı.

*Hüseyn Nəcəfov*





## ONSUZ DA...

Axşam idi. Kəndin işıqları yanmışdı.

Səkinənin kiçik oğlu İsa çörəyini yeyən kimi, pallı-paltarlı yıxılıb yatmışdı.

Ana süfrəni yığışdırdı. Gəlib İsanın başının üstündə dayanıb yatmağına xeyli fikir verdi. Əlini çənəsinə aparıb öz-özünə pıçıldadı:

– Gündüz o qədər ayaq döyür ki, axşam da çörək ağzından düşməmiş daş kimi yatır.

Səkinə əli ilə oğlunu silkələdi:

– İsa, a bala!

İsa yerində qurdalandı, ancaq oyanmadı. Anası onu bu dəfə bir az da bərk silkələdi.

– Ədə, səninlə deyiləm?

O qalxıb yuxulu-yuxulu yerində oturdu. Ağzını marçıldatdı. Qara, qıvrımsaçlı başını qaşıya-qaşıya soruşdu:

– Nə deyirsən ey?

– Nə deyəcəyəm? Deyirəm, dur paltarını soyun, adam kimi rahat yat.

İsa narazı halda başını buladı.

– Eh, onsuz da səhər geyinəcəyəm də. Bir də niyə so-

yunum axı?!

– Tənbəlin biri tənbəl, – deyə anası onu qaldırıb oturtdu, paltarlarını çıxartdı, yerinə saldı.

İsa o saat şirin yuxuya getdi.

Tut yetişmişdi. Uşaqlar ağacın altına yığışmışdılar. İsa altdan-yuxarı boylanıb uca budağın üstündəki oğlana deyirdi:

– Kamran, o nazik budağı çırp, hamısı yetişib.

Kamran budağı silkələdikcə yer tutla dolur, uşaqlar da cücə kimi dənləyirdilər. İsanın ağız-burnu qapqara olmuşdu.

Evə gələndə anası:

– Bu nə ağız-burundu, ay bala? – deyə heyrətini gizləyə bilmədi. – Get yuyun, tez ol. Sir-sifətinə heç baxmalı deyil.

İsa əlini yellədi:

– Eh, nəyini yuyuram ey, bir azdan onsuz da yenə bulanacaq da.

Ana fikrə getdi: "Bilmirəm heç bununla neyləyim? Nə deyirsən, elə deyir "onsuz da", "onsuz da"... Hamısı tənbəllikdəndi".

Bir gün İsa uşaqlarla oynamağa getmişdi. Başı qarışdığından evə gec qayıtdı. Yamanca yorulub əldən düşmüşdü. Bərk də acmışdı.

Həyətə girən kimi anası soruşdu:

– Hardasan, a bala? Haçandı evdən çıxıbsan.

– Top-top oynayırdım, ana.

Bu sözləri deyib səkinin üstündə oturdu:

– Acmışam, ay ana, mənə yemək ver.

Anası oğlunun yorğun görkəminə baxıb sakitcə söylədi:

– Yeməyi neynirsən, ay oğul? Onsuz da bir azdan yenə acacaqsan da.

İsa anasının nə dediyini başa düşüb başını aşağı saldı. Bu əhvalatdan sonra Səkinə bir də oğlunun dilindən "onsuz da..." sözünü eşitmədi.

*Əlibala Hacızadə*



## PƏHLƏVAN

Axşam üstü idi, hava sərinləşmişdi.

Ruzbeh qaça-qaça kənd klubunun həyətinə tərəf gedirdi. Kimə rast gəlirdisə, nəfəsini dərib hədsiz bir sevinc içində deyirdi:

– Kəndə pəhləvan gəlib ey, pəhləvan!

O, yolda dostlarından Xəzərlə Akifi gördü.

Ayaq saxlayıb, iri, qara gözlərini geniş açaraq, əlini klubun həyətinə sarı uzadıb tövşüyə-tövşüyə:

– Hə, bilirsiniz, pəhləvan gəlib ey! – dedi. – Getmirsiz?

– Gedək, – deyə Xəzər təmkinlə dilləndi.

Onlar üçü də qaçmağa başladılar.

– Heç pəhləvan görübsüz? – deyə Ruzbeh xəbər aldı.

Xəzər sanki uşaq olduğunu unudaraq yaşlı adamlara məxsus bir ədayla cavab verdi:

– Yox, harda görəcəkdim? Görməmişəm.

Klubun həyətinə çatanda gördülər ki, uşaqdan böyüyə hamı burdadır.

Adamların üzündə bir şadlıq ifadəsi vardı. Uşaqların isə elə bil bayramı idi. Axı onlar da indiyəcən pəhləvan görməmişdilər.

Ruzbeh qabaqda, Xəzər və Akif də onun dalınca adamların arasından sivişib lap qabağa keçdilər. Oturub yerlərini rahatladılar, sonra meydana tamaşa etməyə başladılar.

Meydanda ortaboylu bir kişi iri, neçə pudluq daşları təkəlli qaldırır, oyuncaq kimi atıb-tuturdu. Sonra dörd-beş adam onun çiyninə çıxdı, heç halına da təfavüt eləmədi. Meydanı dolanıb yerə uzandı, qarnının üstünə taxta, taxtanın da üstünə klubun böyük pianosunu gətirib qoydular. Artistlərdən biri də stulda əyləşib hansı bir havanısa çox qəşəng çaldı. Hər şeydən çox Ruzbehi təəccübləndirən, pəhləvanın belə güclü olması oldu.

– Görəsən o, nə təhər eləyib ki, güclü olub? – deyə Ruzbeh özündən böyük Akifdən soruşdu.

– Nə təhər eləyəcək? Çox yeyib, kökəlib, güclü olub, – deyə Akif cavab verdi.

– Hə?..

Yemək üstündə nənəsini, anasını təngə gətirən, az yeyən Ruzbeh o gündən özünə söz verdi ki, nə versələr hamısını yeyəcək. O qədər yeyəcək ki, axırda bax, belə güclü pəhləvan olacaq.

Ruzbeh sözünə əməl eləyən oğlan idi. O vaxtdan yemək üstündə heç kəsi incitmirdi. Qabağına qoyulan xörəyin hamısını axıra qədər yeyirdi. Bundan əlavə, əlinə nə keçirdisə, yeyirdi. Bir sözlə, axşamacan ağzı işdə idi.

– Nənə, mənə yemək ver, pəhləvan olacağam.

– Baş üstə, – deyə nənə sevinirdi.

– Ana, mənə yemək ver, pəhləvan olacağam.

– Ay mənim ağıllı oğlum, – deyə ana da sevinirdi.

Beləliklə, Ruzbehin əl-ayağı küçədən çəkildi. O, demək olar ki, axşamacan evdə olur, əlinə düşəni yeyirdi. "Mən pəhləvan olacağam," – deyə tez-tez qolunun əzələlərinə baxır, gördüyü pəhləvan kimi evin içində ləngərlə gəzirdi. Heç bir iş görmür, əlini ağdan-qaraya vurmurdu, "Məni işlətməyin, arıqlayaram, pəhləvan ola bilmərəm," – deyirdi. Az bir müddət ərzində o, xeyli kökəldi. Ağırlaşır, tənbəlləşir, burdan durub orda oturmağa ərinirdi. Anası ilə gəzməyə çıxanda tez yorulur, tövşüyür, təngnəfəs olurdu.

Bir dəfə onlara şəhərdən həkim qohumları gəlmişdi. Ruzbehi bu vəziyyətdə görüb maraqlandı, əhvalatı anasından öyrənib onunla söhbətə girişdi:

– Sən nə pis kökəlmisən, ay oğul?

– Çox yeyirəm, istəyirəm pəhləvan olam.

– Pəhləvan olmaq istəyirsən?

– Bəli.

– Sən elə bilirsən təkcə çox yeməklə pəhləvan olmaq olar?

– Bəs necə? Bizim kəndimizə gələn pəhləvan, deyirlər





ki, bir oturuma neçə adamın xörəyini yeyir. Hələ mən balacayam, çox yeyə bilmirəm. Böyüyəndə mən də beş-altı adamın xörəyini yeyəcəyəm.

Həkim güldü:

– Yox, Ruzbeh. Pəhləvan olmaq üçün təkcə çox yemək şərt deyil. Gərək bədən sağlam olsun. Onun üçün isə sən iş görməlisən, hərəkət eləməlisən, ev işlərində nənənə, anana kömək etməlisən. Atalar əbəs yerə deməyiblər ki, iş bədənin cövhəridir. Səhərlər idman elə. Yoxsa belə getsə, səndən qətiyyən pəhləvan olmaz. Belə getsə, səni burdan durğuzub orda oturtmaq üçün evdə gərək bir pəhləvan da saxlasınlar.

... Ruzbeh böyük sözünə baxan uşaq olduğundan o gündən həkimin dediklərini eləməyə başladı. Səhər idmanla məşğul olur, bədənini yaş dəsmalla silir, anasına, nənəsinə ev işlərində kömək eləyir, gəzir, oynayırdı. Əlbəttə, vaxtlı-vaxtında yeməyini də unutmurdu.

Ruzbeh pəhləvan olacağına inanırdı.

*Əlibala Hacızadə*



**NƏNƏM NAĞIL DANIŞIR**

Bir sevinc var hər üzdə,
Nənəm nağıl danışır.
Uzanmışıq qum üstə,
Nənəm nağıl danışır.

Bax, ulduzlar göz vurur,
Ay – başım üstə durur,
Onlar da sanki duyur,
Nənəm nağıl danışır.

Söyüd başını əyir,
İydə üzümə dəyir,
Çinar susub dinləyir,
Nənəm nağıl danışır.

Bir sevinc var hər üzdə,
Nənəm nağıl danışır.
Uzanmışıq qum üstə,
Nənəm nağıl danışır.

*Nəbi Xəzri*





# İLİN FƏSİLLƏRİ



**FƏSİLLƏR**

Qar gedər, yer açılar,
Göydən rəhmət saçılar.
Çəmən, çiçək açılar,
Bil, bu hansı fəsildir?

Quşlar bala balalar,
Maldar ot - ələf çalar.
Sünbül çıxar, dən olar,
Bil, bu hansı fəsildir?

Meyvə dəyib dərilər,
Xırman-taxıl döyülər.
Aləm behiştə dönər,
Bil, bu hansı fəsildir?

Qar aləmi ağardar,
Xalq malı dama salar.
Hər evdə ocaq yanar.
Bil, bu hansı fəsildir?

Üçü bizə yağıdır,
Üçü cənnət bağıdır,
Üçü yığıb gətirir,
Üçü vurub dağıdır.

*Rəşidbəy Əfəndiyev*





**YAZ**

*(N.Gəncəvidən)*

İlin əziz fəsli yaz gələndə ağaclar qış yuxusundan ayılar, budaqlarda qönçə qönçəyə gülər, çöllər gül-çiçəklə bəzənər. Lalələr, yasəmənlər bağı ətri ilə doldurarlar. Zümrüd göylərdən yaşıllıqlara şeh səpilər.

Bənövşə zülfünü darayar, qönçə kəmərini bərk-bərk bağlayıb, tikandan ox atar, qış yuxusundan ayılmış nərgiz də təbiətin şənlik ahənginə qarışar.

Güllər ipək paltarını geyəndə külək, sırğalarından yapışıb oynayar, sünbül ağzından ətir saçdıqca qızılgül ona baxıb həvəsə gələr.

Təbiət nəğməkarı quşlar da əlvan çiçəkləri görüb dil açar, səs-səsə verərlər. Turac, kəklik, qumru, göyərçin ağız-ağıza verib xoş təranələri ilə gül fəslini salamlayarlar.

Yaşıl don geyinər qoca təbiət,
Budaqlara verər ayrı bir zinət.
Bu şadlıq zamanı gülüzlü bahar
Hər gülə geydirər yeni bir paltar.
Küləklər tərpədib səs salar çölə,
Çəmən məskən olar çiçəyə-gülə.

Yaz havası çəmənlərə mirvari səpər. Süddən doymuş bala ceyran anası ilə səhranı seyrə çıxar.

Bülbül cəh-cəh vurub oxuyar, qırqovullar uçuşarlar. Adamlar çəməndə, dağların yaşıl yamacında məclis qurub şənlik edər, gül-çiçək dərərlər.

Yaz fəslində kəndli taxıl məhsulunu becərməklə, çoban sürüsünü dağlarda otarmaqla məşğul olar. Bağbanlar meynələrin, alma, armud, nar ağaclarının başına dolanarlar.

Tutuquşu, sərçə, sığırçın, qumru dəstəylə belədən-belə uçub, sanki günəşi salamlayar. Bağda pardaq gül budaqlarında bülbüllər səs-səsə verib ötər.

*İşləyəni Mir Cəlal*



## İLK BAHAR ÇAĞI

Səfalı bir gündə ilk bahar çağı
Seyr etmək nə xoşdur bağçanı, bağı!
Bənövşə gətirə bahardan soraq,
Nərgiz əllərində qaldıra çıraq.
Quşların qanları gəldikcə cuşə,
Qəlbləri naləylə gələ xüruşə...
Çöllərdə ceyranlar başlaya rəqsə,
Ceyran quzuları verə səs-səsə.
Güllər büsat qura çay sahilində,
Şirindil bülbüllər ola sazəndə.
Qumrunun səsiylə gülün nəsimi
Uyuşa ülfətlə iki dost kimi...



Belə bir fəsildə ən sevimli şey
Rudun ahəngidir, bir də gülgün mey...
Çala badam gözlü bir türk nəğməkar,
Simlərin üstünə tökülə saçlar.
Dağların döşünü bəzədi reyhan,
Otlar yamyaşıldır, güllər al-əlvan
Marallar gül-çiçək içinə batdı,
Səsləri dağ-daşı, çölü oyatdı.
Tikanlar yerini verdi güllərə,
Qarışdı bənövşə müşkə, ənbərə.
Ənbər almaq üçün o xumar nərgiz
Başını qaldırdı yerdən çarəsiz.

*Nizami Gəncəvi*

## BAHAR GƏLİR

Qar əriyir, yaşıl dona
Bürünür uca dağlar.
Dərələrə axır yenə
Gur çeşmələr, bulaqlar.

Qərib, uzaq ölkələrdən
Köçəri quşlar gəlir.
Yenə bahar ölkəsinə
Yaz gəlir, bahar gəlir.

Bahar yeni həyat verir
Gen qoynuna çöllərin.
Qızıl arı qonur qızıl
Ləçəyinə güllərin.

Tarlalara, zəmilərə
Çıxır yenə qız-gəlin.
Geniş çöllər deyir: “Ellər,
Qoynumuza tez gəlin!”

*Yusif Həsənbəy*



## QOZ AĞACI

Sehrşən qoz ağacından qorxduğu qədər heç nədən qorxmur. Axı uşaqlardan eşidib ki, qoz ağacını əkən barını yeməz. O, eşitdiklərini babasına dedi. Babası da onun ağ lent bağlanmış qoşa hörüklərini sığalladı, qayğılı bir səslə:

– Elə deyil, mənim balam, elə meyvə ağacı yoxdur ki, əkən barından dadmasın. Ancaq bir iş var ki, meyvə ağacları müxtəlif vaxtlarda məhsul verir, – dedi, – biri tez, biri gec. Məsələn, tut, şaftalı ağacları uç-dörd ilə, qoz ağacı isə bir az gec bar verir. On-on iki ilə... Ona görə bəziləri qoz ağacı əkmir, üstəlik də bu ağac haqqında o cür söz-söhbət uydururlar. Bax, elə mən özüm bu çağacan iki yüzdən çox qoz ağacı əkmişəm. Özü də hamısının barını görmüşəm. Qocalsam da, yenə əkirəm. Niyə də əkməyim? Ola bilsin ki, indi saldığım qoz ağaclarının barını görməyim. Nə olar, mən yemərəm, siz yeyərsiniz, mənim gül balalarım!

Bu sözlərdən kövrəlmiş Muxtar baba ayağa qalxdı, nəvəsinin əlindən yapışdı, onu həyətdəki qoz toxmacarlığına apardı. Qəvhəyi ilə yaşıl rəngin qarışığına çalan sağlam gövdəli qoz tinglərini göstərib dedi:

– Bunların hər biri nəhəng, qollu-budaqlı cövüz olacaq. Meyvələri də dığal olmayacaq. Barmaqla basan kimi qırılacaq. Ağ ləpələrini yedikcə yeyəcəksən.

Muxtar baba bir neçə qoz tingi çıxartdı. Həyətdəki boş, açıqlıq yerdə çalalar qazdı. Tingləri Sehrşənə verib dedi:

– Hər çalaya bir ting qoy. Sonra tutarsan, mən də diblərini torpaqlayaram.

Sehrşən tingləri çalalara qoydu. Babası da çalaları torpaqla doldurmağa başladı.

Babası inamla işləyirdi. Sehrşənin gözü qabağında "Qoz ağacını əkən barını yeməz" qorxusu əbədilik torpağa basdırılırdı.

*Bayram İsgəndərov*



## BU YAZ

Bu yazın yolunu gözləmişəm çox,
Bu yazın ucundan sızlamışam çox.
Kolların dibini izləmişəm çox, –
Bu yazın nazını çəkəsiyəm mən.

Bu yazın yaxından gördüm üzünü,
Bu yazın dilindən nəğmə süzülür.
Qışın ağlığından doyan gözümü,
Bu yazın gözünə dikəsiyəm mən.

Bu yazın yolunu kəsmək çətindi,
Bu yazın hənrindən qar da çəkindi...
Daşan sevicimi noğultək indi,
Bu yazın başından tökəsiyəm mən.

Bu yazın eşqindən köksüm qabarır, –
Sinəmdən tərtəzə sözlər qoparır –
Təzə bir şerdir onun nübarı,
Bu yazın nazını çəkəsiyəm mən.

*Ələsgər Əlioğlu*

## BAHAR YERİDİ

Qaynayıb çıxdı yaşıllıq,
Quzeyi sıxdı yaşıllıq
Sel kimi axdı yaşıllıq,
Dağı bürüdü, bürüdü.

Hisslər od tutdu tütəklə,
Meşə kökləndi küləklə.
Göylərin gözü şimşəklə
Yaman səyridi, səyridi.

Buludların göz yaşları,
Çəmənləri naxışladı.
Başına yığdı quşları, –
Qovaq yüyrüdü, yüyrüdü.

Şəlalələr işıq saçdı,
Kahalardan zülmət qaçdı.
Daş üstə də ayaq açdı, –
Bahar yeridi, yeridi.

*Ələsgər Əlioğlu*

## SƏHƏR-SƏHƏR



Dağ dalından günəş gülər,
Yamaclarda quzu mələr,
Ceyran qaçıb suya gələr
Bizim yerdə səhər-səhər.

Çəkilməmiş duman hələ,
Yaşıl ördək uçar gölə.
Mahnı səsi düşər çölə
Bizim yerdə səhər-səhər.

Çaylar axar daşa-daşa,
Al geyər çöl başdan-başa,
Quşlar qonar daşdan-daşa
Bizim yerdə səhər-səhər.

*Əhməd Cəmil*

## BALACA QIRMIZI ÇİÇƏK

Balaca Qırmızı Çiçəyin bir gün yaşı var idi. Bircə gün idi ki, Balaca Qırmızı Çiçəyin qönçəsi açmışdı. Qıpqırmızı xırdaca ləçəkləri lap nazik idi. Elə nazik idi ki, kəpənək qonsaydı əzilərdi. Buna görə də kəpənəklər o Balaca Qırmızı Çiçəyin ləçəklərinə qonmurdu, kəpənəklər istəmirdi ki, o ləçəklər əzilsin, uçub gedib başqa güllərə, başqa çiçəklərə qonurdular.

Kəpənəklər özləri də çox yüngül idi, qırmızı idi, göy idi, ağ idi, sarı idi, adam o gözəl, o rəngbərəng kəpənəklərə baxdıqca baxmaq istəyirdi. Buna görə də kəpənəklər başqa güllərə, başqa çiçəklərə qonub Balaca Qırmızı Çiçəyə baxırdı. Balaca Qırmızı Çiçəyin yüngüllüyünü hiss edirdi. Qıpqırmızı xırdaca ləçəklərinin zərifliyini görürdü və kəpənəklər dünyada belə gözəl qırmızı çiçək olduğu üçün sevinirdi.





Həmin gün elə bil ki, günəş də sevinirdi, şüaları bütün çəməni qızdırırdı. Həmin gün çəməndəki güllərin, çiçəklərin rəngləri də sevinirdi, qırmızı göyə qarışmışdı, göy sarıya, sarı yaşıla, yaşıl məxməriyə qarışmışdı və elə bil ki, həmin gözəl yaz günündə çəməndəki bütün bu rənglər gülürdü.

Bülbüllər də çəmənin sevinən rənglərinə baxırdı və gözəl nəğmələr oxuyurdu. Bülbüllərin həmin yaz günündəki nəğmələri dünyanın yaxşı işlərindən, gözəl hadisələrindən xəbər verirdi, anaların laylasından, uşaqların yuxusundan deyirdi.

Günəş də, güllər də, çiçəklər, kəpənəklər, bülbüllər də sevinirdi, təkcə... təkcə o Balaca Qırmızı Çiçək qəmgin idi.

Balaca Qırmızı Çiçəyin zərif ləçəkləri gülə bilmirdi, onlar da o qədər incə və zəif idilər ki, həmin isti, günəşli yaz günü hətta bir az üşüyürdülər də.

O qırmızı çiçəyin yanında Böyük Sarı Gül bitmişdi. Çəməndə bütün güllər, çiçəklər, otlar Böyük Sarı Gülə hörmət edirdi. Böyük Sarı Gül hər şeyi bilirdi, hər şeydən xəbərdar idi. Çəməndə güllərin, çiçəklərin nə sualı olsaydı, Böyük Sarı Gülə verərdi, çünki Böyük Sarı Gülün yaşı çox idi; Bö-

yük Sarı Gülün qönçəsi artıq düz yeddi gün idi ki, açmışdı.

Böyük Sarı Gül Balaca Qırmızı Çiçəyə baxdı, qıpqırmızı incə ləçəklərdəki qəmginliyi gördü və dedi:

– Bu cür gözəl gündür... Bütün çəmənimiz sevinc içindədi... Bəs sən nə üçün sevinmirsən? Nə üçün günəşin şüaları ilə qızınmırsan? Sən nə üçün qəmginsən?

Balaca Qırmızı Çiçək zərif, incə ləçəklərini yüngülcə qaldırıb Böyük Sarı Gülə baxdı və nazik, titrək səsi ilə dedi:

– Bax, o balaca qızın anası var... Bax, o balaca buzovun anası var... Bax, o balaca bülbülün anası var... Bəs mənim niyə anam yoxdur?

Anası balaca qızını qucağına alıb çəməndəki cığırla kəndə tərəf gedirdi.

İnək buzovu yanına salıb dağın döşündən keçirdi.

Bülbülün balaları çəmənə bitişik ağaclıqda başlarını yuvalarından qaldırıb analarının səsinə səs verirdi.

Böyük Sarı Gül o balaca qızın anasına, ana bülbülə, o inəyə baxdı, gülümsədi, sonra elə bil daha da mehribanlaşdı, Balaca Qırmızı Çiçəyə dedi:

– Sən hələ balacasan, ona görə də hələ çox şeyi bilmirsən... Sənin anan torpaqdır. Mənim də, bütün güllərin, çiçəklərin də, bax, o böyük ağacları görürsən, onların da anası torpaqdır.

Sonra Böyük Sarı Gül göz işlədikcə uzanan düzlərə, çəmənlərə baxdı və yenə də Balaca Qırmızı Çiçəyə dedi:

– Bax, görürsən, bizim anamız torpaq necə böyükdür, necə genişdir?

Balaca Qırmızı Çiçək də geniş çöllərə, düzlərə baxdı.

Əlbəttə, Balaca Qırmızı Çiçək sevinirdi ki, onun da anası var. Sevinirdi ki, onun anası belə böyükdür, belə güclüdür.

Amma... amma o sevincdə də Balaca Qırmızı Çiçəyin özü kimi lap yüngül, lap zərif bir qəmginlik var idi, çünki Balaca Qırmızı Çiçək istəyirdi ki, onu da anası qucaqlaya bilsin, xırdaca ləçəklərindən öpsün...

*Elçin*



## HEYDƏRBABAYA SALAM

*(poemadan parçalar)*

Heydərbaba, ildırımlar şaxanda,
Sellər, sular şaqqıldayıb axanda,
Qızlar ona səf bağlayıb baxanda,
Salam olsun şövkətüzə, elüzə
Mənim də bir adım gəlsin dilüzə.

* * *

Bayram idi, gecəquşu oxurdu,
Adaxlı qız bəy corabın toxurdu,
Hər kəs şalın bir bacadan soxurdu.
Ay nə gözəl qaydaydı şal sallamaq
Bəy şalına bayramlığın bağlamaq.

* * *

Şal istədim, mən də evdə ağladım,
Bir şal alıb tez belimə bağladım,
Qulamgilə qaçdım, şalı salladım,
Fatma xala mənə corab bağladı,
Xan nənəmi yada salıb ağladı.

* * *

Yumurtanı göyçək, güllü boyardıq,
Çaqqışdırıb sınanların soyardıq,
Oynamaqdan bircə məgər doyardıq?
Əli mənə yaşıl aşıq verərdi,
İrza mənə novruzgülü dərərdi.

*Məhəmmədhüseyn Şəhriyar*





## BAHAR

Uğur olsun, gözəl bahar!
Səni ellər çox arzular.
Ayaq basdın ölkəmizə,
Şənlik, sağlıq gətir bizə.
Qoy sel kimi yağsın yağış,
İnəyini sağsın yağış.
Sellər axsın, çaylar daşsın,
Sevincimiz başdan aşsın.
Çatır-çatır yansın ocaq,
Qoy şənlənsin oğul, uşaq.
Çöllər, sünbül saçlı əkin,
Parıldasın qızıl təkin.
Dağlar bəzək vursun yenə,
Quşlar məclis qursun yenə.
Dağda, bağda axşam, səhər,
Ətir saçsın bənövşələr.
Həvəs, maraq gəlsin bizə,
Çalışaq öz dərsimizə.

*Abdulla Şaiq*

## CALAQ

Lalə bağa gələndə gözlərinə inanmadı. Çox sevdiyi alma ağacını babası kəsmişdi. Qız məəttəl qaldı. Axı bu alma ağacını babası onun adına əkmişdi. Lalə təəccüblə soruşdu:

– Baba, mənim ağacımı niyə kəsmisən?

– Sənin ağacını calaq edəcəyəm, mənim balam!

Lalə sevindi. O, eşitmişdi ki, calaq vurulmuş ağacların meyvələri böyük olur. İndi Lalənin də alma ağacı calaq olacaq, yazda çiçəyi, payızda meyvəsi ilə başqa ağaclardan seçiləcəkdi. Lalə həvəslə babasına kömək etməyə başladı. Babası nə buyurdusa, gedib gətirdi.



Bir gün sonra baba gördü ki, Lalə bir çaydan suyu töküb calağın üstünə. Su o ki var calağın sarğısını isladıb. Baba çəkdiyi zəhmətə heyfsiləndi. Lakin Laləyə bir söz demədi. Təəssüflə başını buladı. Lalə nə isə bir günah işlətdiyini başa düşdü. Ancaq bilmədi ki, bu nə günah idi. Təşvişlə babasından soruşdu:

– Nədir, baba?

– Nə olacaq, calağı tamam zay eləmisən!

– Çalağı niyə zay eləmişəm, baba? Su vermişəm də!

– Elə su verib zay eləmisən də, ay dəcəl!

Lalə donub qaldı. Heç nə başa düşmədi. Maraqla soruşdu:

– Məgər su verəndə calaq zay olur?

– Olur, mənim balam, olur! Bilirsən niyə? Su təzə calağın şirəsini aparır, qoymur calaq tutsun!

Lalə boynunu günahkar-günahkar bükdü:

– Bunu mən heç bilmirdim!

Babası cod əllərini onun saçlarında gəzdirdi:

– Eybi yoxdur! Kefini pozub eləmə, təzədən calayaram, düzəlib gedər!

– Doğrudan? – Lalə ümidlə soruşdu. – Necə calayacaqsan bəs, baba?

Baba arxayınlıqla bildirdi:

– Darıxma, indi sən özün görərsən!

Baba səliqə ilə sarğını açdı. Bayaq caladığı yeri mişarla kəsib atdı. Təzədən calama apardı. Baba calamanı qurtaranda Lalə onun boynuna sarıldı. Babası gülə-gülə onu qucağına aldı, bir əlini calağa uzadıb Laləyə xatırlatdı:

– Bax, bir də su vermə ha, yoxsa calaq eləməyə daha yer qalmadı.

– Arxayın ol, baba, arxayın ol!

*Cavad Zeynal*

## QARANQUŞ

Sən gələndə, qaranquş,
Bu yerlərə yaz gəlir.
Dalınca qatar-qatar
Durna gəlir, qaz gəlir.
Getmə uzaq, qaranquş,
Sinəsi ağ qaranquş!

Çox ölkələr keçmisən,
Oxu, nəğmən şirindir.
Dünyada ən gözəl yer
Öz yuvan, öz yerindir.
Xoş gəlmisən, qaranquş,
Qalmışdım nigaran, quş.

Yaz quşu, sən gələndə
Açır nərgiz, yasəmən.
Nəğmə dolur qəlbimə,
Söz qoşuram yaza mən.
Qaranquş, ay qaranquş,
Görmə şaxta, boran, qış.

*Teymur Elçin*

## KÜLƏYİN, ÇİNARIN VƏ QARANQUŞ BALASININ HEKAYƏTİ

O çinar ağacı lap balaca idi, sonra gün keçdi, ay dolandı, sonra ay keçdi, il dolandı, o çinar ağacı böyüdü, böyüdü və o qədər illər keçdi ki, o çinar ağacı o qədər böyüdü ki, haçansa eləcə balaca olmağı yadından çıxdı. Yadından çıxdı ki, yanından yüngülcə bir yel ötəndə çöp kimi nazik və sütül gövdəsi az qalırdı sınsın.

O çinar ağacının başı göylərə dəyirdi və bütün yer üzünə də eləcə yuxarıdan aşağı baxırdı və o yüksəklikdən gördüyü dünya o qədər ayaq altında, o qədər kiçik idi ki, özünü həmin dünyanın ən güclüsü hesab etdi.

O çinar ağacı heç nədən çəkinmirdi, heç nədən qorxmurdu və iş o yerə çatdı ki, günlərin bir günündə o çinar ağacının yarpaqları xışıldadı:

– Mən küləkdən də qorxmuram!

Əlbəttə, külək bunu eşitdi, çünki çöllərdə, düzlərdə,



dağlarda, meşələrdə, hətta dənizlərdə, okeanlarda da nə səs olurdu, nə deyilirdisə, külək onu o saat eşidirdi və bütün heyvanların, quşların, bitkilərin dilini bildiyi üçün, o saat da başa düşürdü.

Külək bu xışıltını da eşitdi və qəzəbləndi.

Külək çinar ağacının ətrafında fırlandı, fırlandı, sonra daha da bərk əsdi, sonra lap bərkidi, çovğuna çevrildi, qıy vurub bütün bu ətrafa hücum çəkdi, yer titrədi, göy titrədi, o çinar ağacı silkələndi, yarpaqları qopdu, sonra budaqları qırılmağa başladı və qəzəbli külək o çinarın ətrafında elə bir burulğan yaratdı ki, o boyda ağac uzun-uzun illər bundan əvvəlki o sütül gövdəcik kimi, əsim-əsim əsməyə başladı. Lap az qalmışdı ki, torpaqdan qopsun və külək bircə an dayandı ki, yeni bir qıyla çinar ağacını göyə sovursun.

Külək elə həmin bircə anlıq sükut içində də qəfil bir civilti eşitdi.

O çinar ağacından kənarda köhnə bir dəyirman var idi və külək ancaq çinarın ətrafında burulğan yaratsa da, o burulğanın dalğası dəyirmanın taxtapuşunu qoparmışdı. Dəyirmanın eyvanının dərinində, küncdə, tavanın altında isə bir qaranquş balası idi. Eyvanın o küncünü hələ külək tutmurdu,



amma bayaqdan yer-göy titrəyirdi və o köhnə dəyirman da az qala o taxtapuş kimi, yerli-dibli qopub havaya uçacaqdı.

Qaranquş balası yuvanın içində cıqqılı başını balaca və zəif bədəninə qısmışdı, birdən-birə aləmi bürümüş qasırğadan o qədər qorxmuşdu ki, təkcə öz ürəyinin döyüntüsünü eşidirdi, daha başqa heç nə görmürdü, heç nə eşitmirdi. Həmin o bircə anın içində ki, sükut çökdü, külək o saat o cıqqılı ürəyin döyüntüsünü eşitdi, sonra da o quşcuğazın yenicə dil açdığı qaranquş dilində nə cividlədiyini eşitdi:

– Mən qorxuram...

Hə, külək bu civiltini eşitdi...

Külək yenidən qıy vurmağa tamam hazır idi və bilirdi ki, o qıydan sonra o çinar ağacı köklü-dibli qopub göyə sovrulacaq, amma külək bu civiltini eşitdi və birdən-birə tamam boşaldı, o qaranquş balasının ürəyinin eləcə tıppıltısı içində daha qıy vura bilmədi...

Külək qıy vursaydı, bilirdi, o çinar ağacı ilə birlikdə bu köhnə dəyirman da, bu köhnə dəyirmanla birlikdə o qaranquş yuvası da, o qaranquş yuvasıyla birlikdə o qaranquş balası da göyə sovrulacaqdı...

Balaca qaranquş balası başını qaldırıb yuvadan iki nöqtə kimi xırdaca və qapqara gözləriylə nigaran-nigaran ətrafa baxdı və ətrafın bu sakitliyi davam etdikcə o cıqqılı ürəyin tıp-tıp tıppıltısı da azalırdı.

Külək o cıqqılı ürəyin tıppıltısının eləcə azalmasını eşidirdi və heç cür təzədən qıy vura bilmirdi...

O çinar ağacı isə yavaş-yavaş özünə gəlirdi və qolu-budağı sınsa da yenə əvvəlki kimi, yer üzünə yuxarıdan aşağı baxa-baxa deyirdi:

– Gördünüz?! Külək mənə heç nə eləyə bilmədi!..

*Elçin*



## NOVRUZ BAYRAMI

Novruz sözünün mənası "yeni gün" deməkdir. Bir çox şərq xalqları kimi Azərbaycan xalqı da qədim zamanlardan başlayaraq gecəylə gündüzün bərabərləşdiyi 21 mart gününü yazın gəlməsilə əlaqədar olaraq bayram etmişdir. Yazda təbiətin oyanması zamanı insanlar təmizlik işləri aparır, torpağa xüsusi qayğı göstərirlər. Hamı onun gəlişini bayram edir. Ev-eşik səliqəyə salınır, insanlar təzə paltar geyir, yumurta boyayır, şirniyyat hazırlayırlar. Küsülülər barışır, insanlar qohum-qonşusunu bir-birinə qonaq çağırırlar. Novruz çərşənbələrində tonqal qalanır, şənliklər keçirilir. Sazımız, sözümüz bu bayramı tərənnüm edir.

*Azad Nəbiyev*

Elə ki, fəsli-yaz olur,
Gecə-gündüz taraz olur.
Artır havanın istisi,
Daha soyuqlar az olur.

*Abbas Səhhət*

## SU ÇƏRŞƏNBƏSI

Novruz bayramının ilk çərşənbəsi su çərşənbəsi sayılır. Əzəl çərşənbədə sübh tezdən duru qaynayan bulaqdan su götürərlər. Deyirlər, su çərşənbəsi günündə sübh tezdən axar duru suyun üstündən keçənlər azar-bezarını suya töküb axıdar. Adamlar buz kimi bulaq suyunda əl-üzlərini yuyar, bir-birlərinin üstünə zarafatla su çiləyərlər. Su axan yerləri təmizləyər, məhəllələrin yanından su axmaq üçün arxlar salarlar. Adamlar su üstündə günah iş tutmayacaqlarına and içər, hamıya yaxşılıq edəcəklərinə söz verərlər.

*Azad Nəbiyev*

### Bayatı

Su axır samanlıqdan,
Yol keçər qaranlıqdan.
Çalış yaxşılıq elə,
Nə çıxar yamanlıqdan?!

### Tapmaca

Dağdan gəlir dağ kimi,
Qolları budaq kimi,
Əyilir su içməyə
Bəyirir oğlaq kimi.
*(sel)*



### Atalar sözləri

Su olan yerdə dirilik olar.
Su murdarlıq götürməz.
Su bardağı suda sınar.

### Məsəllər və inanclar

Süfrəyə su dağılanda deyərlər: "Su aydınlıqdır".
Su içən adama ilan da dəyməz.
Məsəl var, deyərlər: su kiçiyindir, yol böyüyün.
Qaranlıq yerdə qaynar suyu torpağa atmazlar.
Odu su ilə söndürmək günahdır, deyirlər.
Yuxuda duru su görənin həmin gün işi uğurlu olar.





## OD ÇƏRŞƏNBƏSİ

Novruz bayramı çərşənbəsinin ikincisi od çərşənbəsidir. İnsanlar ta qədim vaxtlardan torpağı isidən günəşi, onun yerdəki rəmzi olan odu müqəddəs saymışlar. Düşünmüşlər ki, insanlar günəşi və odu nə qədər əzizləsələr, oxşasalar təbiət o qədər tez isinər. Od çərşənbəsi ilə əlaqədar nəğmələr, rəvayətlər də yaranmışdır.

Od çərşənbəsi günündə adamlar hündür bir yerdə tonqal qalayardılar. Tonqalın dövrəsinə toplaşıb günəşin çıxmasını gözləyirdilər.

Günəş doğanda onlar "Qodu-qodu" mahnısını oxuyub, tonqalın ətrafında dövrə vurar, öz məşəllərini yandırıb ocaqlarını yandırmaq üçün evə tələsərdilər.

*Azad Nəbiyev*

Qodu xan, Qodu xan,
Söndürmə odu, xan.
At üstə od gətir,
Ulusa od gətir.
Sözü bal Qodu xan,
Özü al Qodu xan!

Qodu xan yoldadır,
Əlləri baldadır.
Busatı daldadır.
Sözü bal Qodu xan,
Özü al Qodu xan...

Tapmaca

Burdan vurdum baltanı,
Ordan çıxdı qaltanı.
Anam bir oğlan doğub,
Yerin-göyün sultanı.
*(günəş)*

Atalar sözü

Odsuz ocaq olmaz.
Od düşdüyü yeri yandırar.
Od yanan yerdən tüstü çıxar.
İnsanlar oda and içiblər: "Od haqqı! ", "Ocaq haqqı!" deyiblər.
"Ocağın odun olsun!", "Ocağın gur yansın!" deyiblər.

## YEL ÇƏRŞƏNBƏSİ

Qədim inanca görə yel üçüncü çərşənbədə - yel çərşənbəsində dünyanı gəzib oyanmış suyu və odu hərəkətə gətirir. Günəş bir gündə bir neçə dəfə dəyişir. Özü də təzələnir, təmizlənir.

Su kimi, od kimi yel haqqında da Novruz bayramında nəğmələr söylənir:

A Yel baba, Yel baba,
Qurban sənə, gəl, baba.
Taxılımız yerdə qaldı,
A Yel baba, Yel baba,
Qurban sənə, gəl, baba!
*Azad Nəbiyev*



Məsəllər

Yel aparan yelinki,
Yerdə qalan elinki.

Yel qayadan nə aparar?

Yelnən gələn selnən gedər.





## TORPAQ ÇƏRŞƏNBƏSİ

Bu çərşənbəyə ilaxır çərşənbə də deyirlər. Sonuncu çərşənbədə torpaq oyanır. Su isinir, hava normallaşır, əkinə hazır olur. Torpağa toxum səpmək olar.

İlaxır çərşənbə ilin ən əziz günlərindən sayılır.

Atalar sözü

Torpaq müqəddəsdir.
Torpaq deyər, öldür məni, dirildim səni.
Torpaqdan pay olmaz.
Torpağa and içiblər – "Torpaq haqqı!", "Yer haqqı deyiblər".

Bayatı

Bu yerlər tala yeri,
Bürc yeri, qala yeri.
Qiyamət o gün qopar,
El köçə, qala yeri!

Deyimlər

Axır çərşənbə axşamı küsülülər barışarlar.
Qaranquş, novruzgülü, bənövşə, qar çiçəyi yazın elçiləri sayılır.

Axır çərşənbə və Novruz axşamı bayram keçirə bilməyənlərin qapılarına səməni xonçası aparanlar həyətləri gəzər və belə mahnı oxuyarlar:

Mən sehrli sünbüləm,
Mən xeyirli sünbüləm.
Tarlalar oylağımdır,
Yamaclar yaylağımdır.
İnsanlara gərəyəm,
Bərəkətəm, çörəyəm.
Yolçular yoldaşıyam,
Oğuzun qardaşıyam.
Ağ günlər yayanam mən.
İnsana hayanam mən.
Mən dünyanı gəzərəm,
Mən dünyanı bəzərəm.
Mən xeyirli sünbüləm,
Mən sehrli sünbüləm.



*Azad Nəbiyev*

**YÜZ YAŞINDA BAĞBAN**

Yüz yaşına çatmış bir bağban çox qoca olduğundan əli-ayağı əsirdi. Onun bir bağı var idi. Bu qoca bağban öz bağında bir para yüngül işləri özü tutub və bir parasını oğlanlarına gördürərdi. Yaz fəslində bir neçə cavan oğlan bağa seyrə gəlmişdilər. Bunlar gördülər ki, bir qoca kişi əli-ayağı əsə-əsə torpağı yumşaldıb toxum səpir. Ondan soruşdular:

– Ey baba, nə iş görürsən?

Bağban dedi:

– Alma toxumu səpirəm.

Soruşdular ki, nəyinə lazımdır?

Dedi:

– Bu toxumdan xırda alma ağacı bitəcəkdir, sonra peyvənd edəcəyəm.



Oğlanalr qocanın niyyətini bilib dedilər:

– Ey baba, sənin yüz yaşın var, toxumdan çıxan cırı calayıb əmələ gətirəndən sonra meyvəsini görməyə çox ömür istər. Zəhmət çəkmə, buna sənin ömrün çatmaz.

Qoca bağban bunların sözünə gülüb cavab verdi:

– Əzizlərim, əkiblər yemişik, əkərik yeyərlər.

*Rəşidbəy Əfəndiyev*



**AĞ ÇİÇƏK**

Kaktus açıb ağ çiçək,
Çiçəyi ləçək-ləçək.
Onu nənəm becərib,
Əzizdir mənə çiçək.

Eyvana yaraşıqdır,
Elə bil ağ işıqdır.
Baxdıqca doymaq olmur,
Ona əl vurmaq olmur.

Tikanlıdır gövdəsi,
Batar ələ iynəsi.
Kaktusun gövdəsində
Çoxdur yumru pöhrəsi.

*Münəvvər Tapdıqova*



## YAY

*(N.Gəncəvidən)*

Səma sultanı Günəş göylərin dərinliklərindən Yer üzünə nur və hərarət yağdırar.

Ağaclar əlvan bəzənib fəxr etdikləri halda, insanlar isti paltarlarını soyunar, açıq havada rahat nəfəs alar, tarlada, tikintidə daha sərbəst işləmək istərlər.

Günlər uzanar, gecələr qısalar. İşdən yorulanlar gecənin şirin yuxusunu nağıla, söhbətə dəyişməzlər.

Biçinçilər dənlə dolu sünbülləri oraqla biçib dərz bağlar, xırmanlarda dağ kimi qalayarlar, səhərin, axşamın sərinində işləmək hər kəsə xoş olar. Günorta – Günəşin od tökdüyü vaxt hamı kölgəlik axtarar.

Bağda, bostanda kəndlilər məhsula baxıb sevinərlər.

Çöllərdən, meşələrdən ilbiz, bayquş səsi eşidilər.

Uşaqları tut ağacına dırmaşan, quzularla oynaşan, göldə, çayda çimişən görərsən. Çayların bol suyu azalar, hər tərəfi yarpız, reyhan ətri doldurar.

Yayda göyün üzü təmiz, ayaz olar. Kəhkəşan ulduzlarla bəzənmiş payəndazını şimaldan cənuba sərər. Münəccimlərin gözünə yuxu getməz.

Bəzən də küləklərin gətirdiyi ötəri ala-tala buludlar haray salıb şıdırğı yağış tökər, yazı da, payızı da yada salarlar.

Yayda ovçular silahlarını yerə qoyar, maral, ceyran, kəklik, qırqovul körpələrinə rəhm edər, balanı anasız qoymaqdan çəkinərlər.

Yay fəsli məxluqatın sevdiyi, bəyəndiyi, Günəşin insana, insanın Günəşə bəhrələndiyi zamandır.

*İşləyəni Mir Cəlal*





## YAYIN TƏSVİRİ

Bürkü səhralara od-alov saldı,
Meyvələrin ağzı açıla qaldı.
Bülbül çöldən dağa eylədi səfər.
Səsləndi qürbətdə qərib nəğmələr.
Qızdı yay gününün isti nəfəsi,
Çalı quşlarının kəsildi səsi –
Yayın ən şiddətli isti çağında,
Daş muma dönəndə gün qabağında,

Meyvənin xoş ətri basanda bağı,
Kəndlilər unudar evi, otağı.
Meyvələr çoxalar, bağlar varlanar,
Belə bir bolluqdan yer vüqarlanar.
Ləl ilə bəzənmiş bir tac kimi nar,
Uzaqdan çıraqtək alışıb yanar.
Tənəklər şərabdan nəşələnərək
Sarılar almaya, nara sərxoştək.
Əncir yeyən quşlar oğrutək pünhan
Asılar ağacın budaqlarından.

*Nizami Gəncəvi*

## ÇİYƏLƏK

Qonşu bircə kök
Çiyələk verdi:
Öz torpağıyla
Qazıb götürdü.

Suladı tez-tez
Bağban ləkləri.
Bağı götürdü
Çiyələkləri.

Ağ çiçəklərə
Büründü hər lək.
Asıldı dən-dən
Qızıl çiyələk.

Tək bircə kökün
Hünərinə bax!
Çiyələk oldu
Bütün bağça-bağ.

*Ilyas Tapdıq*







## BİR SƏBƏT ÜZÜM

Nazimgil şəhərdə yaşayırdılar. Xəzərin sahilində qəşəng bağları vardı. Nazimin babası Əhməd kişi kənddə qalır, bağa qulluq eləyirdi.

Bir yay yenə Nazimgil bağa köçmüşdülər.

Nazimin atası mühəndis idi. Şəhərdən xeyli uzaqda olan təzə tikintidə işləyirdi. Buna görə də evə həftədə bir dəfə gəlirdi. Nazimin babası arabir meyvə dərib oğlu üçün aparırdı.

Bir dəfə səhər Nazim babasının təzə tikintiyə getməyə hazırlaşdığını görüb nə isə fikirləşdi. Mətbəxə qaçıb balaca səbəti götürdü. Bağın aşağısındakı meynənin yanına gəldi. Burada onun babası altı il əvvəl, Nazim anadan olan il bir meynə əkmişdi. O vaxtdan bu meynəyə hamı "Nazimin meynəsi" deyirdi.

Nazim, dörd yaşına girəndə babası onu həmin meynənin yanına gətirib dedi:

– Nazim, oğlum, daha böyümüsən, bundan sonra meynənə özün qulluq elə...

Nazim təzəcə üzüm gətirməyə başlayan meynəyə qulluq etməyə başladı.

Bu il onun meynəsi xeyli üzüm gətirmişdi. Qumun üs-

tünə yatan meynənin hansı yarpağını qaldırırdınsa, ağ şanının iri salxımı görünürdü.

Nazim hələ yaxşı dəymənmiş şanıdan bir səbət dərib üstünü göy yarpaqlarla örtdü. Babası şəhərə getmək istəyəndə:

– Bunu atama verərsən, deyərsən Nazim göndərib, – dedi.

Baba Nazimin dərdiyi üzümün üstünə qoyulmuş yarpaqları aralayıb salxıma baxdı və bir gilə qoparıb Nazimə uzatdı:

– Al, ye, gör necədir?

Nazim kal giləni dişi altında əzəndə ağzını büzdü.

– Hə, necədir, turşdur? – deyə babası ondan soruşdu.

Nazim başını tərpədib: "Hə", – dedi.

– Oğlum, adam atasına kal meyvə göndərməz.

Nazim kal üzümlərə baxıb heyfsiləndi.

Babası Nazimin pərt olduğunu görüb dedi:

– Nazim, eybi yoxdur, keçib gedər. – Amma yadında saxla ki, üzümün yetişmişini dərərlər. İndi səbətini götür, mən dərdiyim üzümlərdən yığ, atana aparım.

Nazim babasının bu sözündən sevindi və cəld işə başladı.

*Hacı Ağayev*

## ALMA AĞACI



Bir ağac çiçəklədi,
Babam dedi: – Almadı.
Möhkəm durdu budaqlar,
Vaxtsız çiçək salmadı.

Gözlədik, əzizlədik,
Kimsə onu yolmadı.
Yetişəndə meyvəsi,
Payladı bir-bir bizə,
Bıy, özünə qalmadı...

*Məmməd Aslan*





## PAYIZ

*(N.Gəncəvidən)*

Payız gələndə məhsul yığılar, yarpaqlar tökülər. Havalar soyuyar, sular bulanar. Bağlar sarı örtüyə bürünər. Xəzəl tökülüb suların rəngini dəyişər. Nərgiz, yasəmən, qızılgül solub saralar. Küləklər əsib ilan kimi belədən-belə qıvrılar, toz-torpağı göyə sovurar.

Dağ da, dərə də, çəmən də, bağ-bağat da əlvan libasını soyunar, qəmli bir görkəm alıb, təravətini itirər. Dəniz tufanına düşən adamlar qorxudan libasını soyunan kimi ağaclar da yarpağını töküb çılpaq dayanar.

Tülkülər, dovşanlar, canavarlar vurnuxub yem axtarar-lar. Zalım ovçular fürsət tapdıqca onların canına qəsd edərlər. Bədəncə zəiflər, ürəyi-ciyəri naziklər evlərə çəkilib səhhətini qorumaq üçün tədbir tökərlər.

İl uzunu zəhmət çəkən, bağ bəsləyib məhsul becərənlər üzümü, almanı, narı, heyvanı, armudu toplayıb qış azuqəsi tədarük edər, torpağa, ağaca dinclik verərlər.

Qızıl alma, ağ alma öz görkəmi ilə lovğalanaraq nara, heyvaya yanıq verər: "Halın necədir?"

Nar öz növbəsində qırmızı sinəsini səxavətlə açaraq yaralı qəlblərə qan, can verər.

Püstənin ağzı açılar, innabın dodağı büzülər, narınc-turunc ətrafa ətir saçar.

*İşləyəni Mir Cəlal*

## PAYIZ

Payız olur, əsir soyuq küləklər,
Solur dağda, çöldə əlvan çiçəklər.
Gecələr uzanır, günlər qısalır,
Göy üzünü qara buludlar alır.
Yağış yağır, duman çökür çöllərə,
İnildəyir çayır, çəmən, dağ, dərə.
Ağaclarda nə meyvə var, nə yarpaq,
Bağ-bağçalar olmuş bütün çıl-çılpaq.
Quşlar uçub dəstə-dəstə gedirlər,
İsti yerə köçüb, qışlaq edirlər.

*Abdulla Şaiq*

## SON BAHAR

Dağları görəndə
Ürəyim quş oldu.
Yarpaqlar saralıb,
Çəmənlər yaşıldı.

Havada bir azca
Sazaq var, ayazdı.
Torpaqda bahardı,
Budaqda payızdı.

Tökülən xəzələ
Yer açıb ovcunu.
Qaytarır ağaclar
Torpağın borcunu.

*Rafiq Yusifoğlu*





## PAYIZ YETİŞƏNDƏ

Əsdi xəzan yeli, payız yetişdi,
Bağların əhvalı tamam dəyişdi.
Küləklər taladı bağçanı, bağı,
Söndü al güllərin yanar çırağı.
Arxlar kənarında otlar sapsarı,
Töküldü reyhanın şux yarpaqları.
Sanki ağaclıqda odlar qalandı,
Əlvan yarpaqları alışdı, yandı.
Gördü bazarını kəndli pərişan,
Bağın qapısını bağladı bağban...
Çeşməsiz, çiçəksiz bağ şad olarmı?
Hasarsız, barısız abad olarmı?..
Kəsilmiş nəğməsi ötən quşların
Dolaşır qıçına xəzan ruzgarın.
Seyrə gələnlər də bağı tərk etmiş,
Müğlər də çəməndən ayrılıb getmiş.
Bağı tərk eləyib getmiş gözəllər,
Nə bülbül səsi var, nə güldən əsər.
Tikanlar dağ çəkib gülün köksünə,
Bəzəksiz, cəh-cəhsiz qalıb bağ yenə.

*Nizami Gəncəvi*



## OV

Dayımın tüfəngi və ov çantası var.

Onun itləri də var: bunlardan ikisi tazı, ikisi heyvanaxtaran, biri də quşaxtaran itlərdir. Bu yaxınlarda dayım tüfəngini götürüb mənə dedi:

– Mənimlə ova getmək istəyirsənmi? Tülkü yenə iki toyuğumuzu aparıb, onu vurmaq istəyirəm.

Biz iki heyvanaxtaran və bir quşaxtaran iti götürüb getdik. Heyvanaxtaran itlər tezliklə heyvanın izini tapıb, meşədə yox oldu. Biz ancaq onların hürdüklərini eşidirdik, elə bil komanda ilə hürürdülər: "Ham-ham! Ham-ham!"

Dayım mənə dedi:

– Gəl, burda kolun dibində oturaq. Ağıllı itlərim indi heyvanı düz bizim üstümüzə qovacaqlar.

Biz oturub gözlədik. İtlər hardasa, çox uzaqda hürürdü. Mən elə bilirdim ki, itlər heç bir vaxt qayıdıb gəlməyəcək. Amma onların səsləri getdikcə daha da yaxından eşidilməyə başladı... birdən kolların içindən bir dovşan, onun ardınca da yekə kürən bir tülkü çıxdı. Dayım tətiyi çəkdi və tülkü yumalandı; dovşan isə qorxdu, yerə yatıb qulaqlarını belinə qısdı – daha yerindən tərpənmədi. Biz onu diri-diri tutub evə gətirdik. Mən indi də onu kələmlə bəsləyirəm.

*Konstantin Uşinski*



## ŞABALID PAYI

Payızdır. Təbiət yaşıl donunu dəyişir. Ağacların altından, yollardan keçəndə ayağının altında xəzəl xışıldayır. Sarı-qızılı yarpaqları yara-yara gedirsən. Ağacların əlçatmaz yerində, lap zoğun ucunda yarpaqlar töküləndən sonra gizlənib qalan bir alma, ya bir qoz görürsən. İstəyirsən onu daşla yerə salıb yeyəsən. Nədənsə, o sonuncu alma, sonuncu qoz payı çox dadlı olur. Payızın sonlarında şabalıd, əzgil yetişir. Yağan yağışlar, güclü küləklər meyvələri yerə tökür.

Bir payız səhəri İbrahim yuxudan duranda gördü ki, həyətdəki ağacların altı qızılı-sarı yarpaqlarla örtülüb. Axşamdan yağan çiskin yağış hələ kəsməmişdi. "Necə şabalıd yığmağa getməli havadır," deyə İbrahim otağa getdi, qardaşını yuxudan oyatdı:

– Bəkir, dur, gör necə hava var? Yəqin ağacın yan-yörəsinə çoxlu şabalıd tökülüb. Qonşu Almaz xalanın oğlu Sübhanı çağıraq. Birlikdə meşəyə şabalıd yığmağa gedək.

Bəkir yuxulu gözlərini ovuşdura-ovuşdura:

– Deyirlər, ayı da şabalıdı xoşlayır. İndi yəqin ağacın altını kəsdirib. Yox, mən getmirəm.

– Necə yəni, getmirəm? Tez ol dur, yoxsa Sübhanla özüm gedərəm. Sonra sən peşman olarsan, tez ol dur, yuyun. Sən də özünə dağardan-zaddan götür. Anama de, bizə meşədə yeməyə pendir-çörək qoysun. Qaş qaralana kimi qayıdıb gələrik. Mən də gedim Böyük nənədən maral dərisindən olan dağarcığı götürüm. İndi gələrəm.

Maral dərisindən düzəldilmiş sarı dağarcıq nazik və yumşaq idi. Çiyinə keçirmək üçün ipləri də vardı. İbrahim yarım saat keçməmiş dağarcığı nənəsindən götürüb qayıtdı (maral dağarı İbrahimin adını daşıdığı böyük İbrahim babasından yadigar qalmışdı. O, məharətli ovçu olmuşdu). Gördü ki, qonşu Almaz xalanın oğlu Sübhan da Bəkirlə oturub süfrə başında çay içirlər. İbrahim stola yaxınlaşdı və onları tələsdirdi:

– Hə, nəyiniz var götürün, getdik.

Özü də ayaqustü ona süzülən çayı içdi. Sonra da bir-birlərinə qoşulub meşəyə getdilər. Nigar xala dedi:

– Eh, bunlar şabalıd yığan deyillər, özlərini əldən salırlar. Meşə yolunda xışıltı-zad eşidən kimi ürəkləri yarılacaq.

Qonşu Almaz xala cavab verdi:

– Niyə elə deyirsən, sizin İbrahim qoçaq uşaqdır. O, qorxaq deyil, kişi qırığıdır. Sübhanla Bəkir ona baxıb qeyrətə gələrlər.

Uşaqlar xeyli getdikdən sonra yolda dayanıb bir az yorğunluqlarını almağa başladılar. Analarının yola qoyduğu pendir-çörəyi torbalarından çıxarıb çəmənlikdə oturdular, çörək və pendirdən götürüb yeməyə başladılar. Bəkir isə eləcə qorxa-qorxa ətrafına boylanırdı. Hər bir xışıltıya, quşların pırıltı ilə kol dibindən uçmasına diksinirdi. Sübhan və İbrahim Bəkirə gülürdülər. Bəkir onların gülməyini görüb əsəbiləşirdi. "İndi kolun altından bir ayı çıxsa, onda görərəm kim-kimə güləcək", deyirdi.

Bəkir elə bunu deyib qurtarmışdı ki, uşaqların səsindən qorxan boz dovşan qulaqlarını dik tutub bunların oturduqları yerin yanındakı kolluqdan yel kimi qaçıb getdi. Bunu görən Bəkir yerindən cəld sıçradı və Sübhanın yanında çöməldi. Bəkir dedi:

– Sübhan, dur getdik. Çox otursaq, çox şey görərik.

Bəkir başını qaldırıb yan-yörəsinə, uşaqlara baxmağa elə bil qorxurdu. Onlar Pəri qaladan yuxarı qalxdılar. Şabalıd ağacları olan yerə çatdılar. Dağar və çantalarını bellərindən açıb yerə qoydular. İbrahim dedi:

– Mən ağaca çıxım. Siz isə yerə tökülən şabalıdları yığın.

Ağacın altı kirpi balasını xatırladan tikanlı qozalar və qozadan çıxmış şabalıdla dolu idi. Sübhan və Bəkiri qorxu bürüdü:

– Doğrudan birdən ayı gəlsə nə edərik, hə?

İbrahim dedi:

– Daha hamı ağaca çıxmaz ki, həm də ayı gəlsə, elə bi-





lirsən ağaca çıxa bilməz? Ağaca elə dırmaşır ki, adamdan da cəld və çevik. Ayı gəlsə birinci onu mən görəcəyəm.

İbrahim ağaca dırmaşıb çıxdı. Budaqları silkələdi. Şabalıdlar yerə töküldükcə Sübhanla Bəkir tez-tez yığırdılar. Sonra İbrahim də ağacdan düşüb onlara qoşuldu. Köməkli dağar və torbalarını doldurmağa başladılar. Asanlıqla çıxmayan tikanlı qozaların içərisindən şabalıdı haçalı çubuqla çıxarırdılar. Bəkir şabalıd qərzəyinin tikanı əlinə batdıqca "uf" eləyib, əlini ağzına aparırdı. Beləliklə, uşaqlar az da olsa torba və dağarcığa şabalıd yığdılar.

Qaş qaralırdı. Hava buludlu və çiskin idi. Uşaqların başı elə qarışmışdı ki, vaxtın necə keçdiyini hiss etməmişdilər. Qayıdanbaş onlar yollarını meşənin ən sıx yerindən saldılar ki, kəsə yollarla tez evə gəlib çıxsınlar. Uşaqlar birdən meşə talasına çıxdılar. Burada içiboş ağ tısbağa çanağını gördülər. Sübhan çanağı əlinə götürüb baxdı. Bəkirlə İbrahim də yaxın gəlib ona baxdı. Sübhan dedi:

– Görəsən, bunlar qocalıb ölüb, çanağı boş qalıb, yoxsa nəsə öldürüb?

İbrahim cavab verdi:

– Onu necə ordan çıxarıb başqa heyvan yeyə bilər? Yəqin özbaşına ölüb ki, onu cücü-mücü söküb, dağıdır.

Bəkir dilləndi:

– Mən o gün xalamgilə getmişdim, birdən ürəyim istədi fındıq bağına gedim. Bir də gördüm ki, fındıq kolunun dibində xəzəl tərpənir. Diqqətlə baxdım, fikirləşdim bəlkə ilan-zaddı mənə tərəf sürünən. Yox, bu sarıyaçalan boz çanaqlı tısbağa balasıdır. Bu tənbəl heyvanı əlimə aldım və ağzıyuxarı çevirib ona diqqətlə baxdım. O, qorxusundan ayaqlarını və başını çanağının içinə yığmışdı. Bir tikə burnunun ucu görünürdü. Onu evə xalamgilə gətirdim. Xalam mənə acıqlandı:

– Ay oğul, bu heyvancığazı niyə gətirdin, bu ev heyvanı deyil ki, evdə saxlayasan, apar onu burax gətirdiyin yerə. Orda onun üçün rahatdır. Fağır heyvandı, qabağına çıxan cücü-mücüdən, bitkidən yeyib dolanır. Həm də ay oğul, o yaşadığı yerin bəzəyidir, onu incitmək olmaz.

İbrahim cavab verdi:

– Xalam düz deyir də! Mən də müəllimimiz zoollogiya dərsində danışanda eşitmişəm ki, elə ölkə var ki, orada adamlar onun ətini yeyir.

Uşaqlar öz aralarında belə maraqlı söhbət edə-edə gəlirdilər. Onlar kəndə çathaçatda hava tamam qaralmışdı. Nigar və qonşu Almaz xala uşaqlardan nigaran qalmışdılar. Nigar çəpərin yanına gəlib Almazla danışırdı:

– Görəsən, bu uşaqlar harda qaldılar? Bəlkə bunlara vəhşi heyvan-zad rast gəlib. Bizim Bəkir lap tülküdən qorxan Əhməddir.

Almaz xala isə Nigar xalaya irək-dirək verirdi:

– Yox, qorxma, harda olsalar gəlib çıxarlar. Sübhan və İbrahim qoçaqdırlar.

Nigar xala çəpərdən uzaqlaşdı, evə sarı gəlib eyvana çıxdı. Neft lampasını yandırdı. Elektrik işıqları hava yağış və küləkli olduğundan sönmüşdü. Elə otağa keçmişdi ki, buxarıdakı ocağa bir-iki odun qoysun. Bu vaxt məhlədə Toplanın hürməsini eşitdi. Toplan yad uşaq görən kimi, o



saat dayanmadan hürür və boynu zəncirdə ola-ola gah irəli dartınır, gah da hürə-hürə yerinə qısılırdı.

Yolda doqqazın yanında səs gəlirdi. Uşaqlar gəlib çıxmışdılar. Onlar qəsdən səslərini çıxartmırdılar ki, analarını "qorxutsunlar". İbrahim səsini çıxarmaq istəyəndə, Bəkir onu dümsüklədi və əli ilə İbrahimin ağzını tutub "su-u-ss" dedi. Qoy evə yaxın gələk, anam bizi birdən görsün. Elə bil meşə yolunda tez-tez yan-yörəsinə baxan, qorxan Bəkir deyildi. Uşaqlar evin lap qənşərinə çatdılar. Nigar xala qollarını məhəccərə dirsəkləyib gələnlərə baxırdı. Bir də gördü ki, Bəkir atılıb qışqırmağa başladı:

– Ura-a! Anacan, biz şabalıd gətirdik. Sən elə bilirdin ki, biz ora gedib çıxa bilmərik, meşə guya ki, qorxuludur. Heç də yox!

Sübhan sağollaşıb evlərinə uzanan cığıra üz tutdu. Bir azdan Almaz xalanın səsi gəldi:

– Ay qız, Nigar, gözün aydın, qocaqlar gəlib çıxdılar.

Bəkirlə İbrahim dağar və torbalarını yerə qoyub, yuyunub otağa keçdilər. Buxarının qabağında oturub qızınmağa başladılar. Bəkir dedi:

– Anacan, o şabalıddan gətir, bişir, bir az nübar edək.

Nigar xala dağardan bir-iki ovuc şabalıd götürüb bıçaqla çərtdi, sonra duzlu su olan qazana töküb ocağa qoydu.

Qardaşlar yolda gördüklərini bir-birinin sözünü kəsə-kəsə analarına danışırdılar. Ana onlara şam yeməyi verdi. Yığdıqları şabalıddan da iştahla nübar etdilər. Böyük nənənin də şabalıd payını ayrıca qoydular.

*Münəvvər Tapdıqova*

## KÖÇƏRİ QUŞLAR

Köçəri quşlar köçər,
Bu yerdən o birinə
Uçub, gedib çıxarlar,
Dünyanın hər yerinə.

Onların gözünə bax,
Niyə elə soyuqdu?..
Onların yuvası var,
Onların yurdu yoxdu.

*Əli Həkim*

## OVÇU BABANIN SÖHBƏTİ

Bir gün atamla ova çıxdım. O zaman bu meşələrdə qoruq-qaytaq yoxdu. İstədiyin vaxt ov edə bilərdin. Dərədə, Maral gölü yaxınlığında pusquda durmuşduq. Atamla ertədən gölün ətrafını gəzib dolaşdıq. O, torpağa yatmış enli ayıdöşəyi yarpaqlarının üstündə qaralan ləkələri, nar yarpağına oxşar ətli xırda yarpaqları olan əzilmiş sarağan kollarını göstərib dedi:

– Bax, görürsən, heyvan dırnağının izidir. Cüyür, ceyran bir yerə alışdımı, hər dəfə o yerdən gəlib su içər. Mən bu aradaca duracağam. Sən isə dağ ətəyində olarsan. İşdir, heyvan bu arada hürküb qayıtsa, birbaş sənin üstünə çıxacaq. Onlar qəribə heyvandır. Yatağı olmaz, elə düzdəcə, harada olsa gecələyər. Buna görə də ovçu çox vaxt onu suya gələndə ovlayar.

Mapal gölü dərədədir. Səhər ertə dağdan əsən meh qoymur ki, heyvan iy alsın. Buna görə də bura ov üçün çox əlverişli yer hesab olunur.

Göyün üzü təzəcə bozarmağa başlamışdı. Dağdan əsən soyuq meh adamı qılınc kimi kəsirdi, otların, çiçəklərin üstünə ağappaq qırov düşmüşdü. Mən moğalı kollarının dalında uzanmışdım. Ürəyim yanırdı. Bir papiros çıxarıb yandırdım. Çəkdim, nəfəsim qızışdı. Qabaqda dizə kimi qalxan otların başı tərpəndi, papirosu tez yaş yarpaqların üstünə basıb söndürdüm. Elə bu vaxt xeyli məndən aralı bir başqa baş göründü. Bu cüyürdü. Yanında balası vardı. Nazlana-nazlana gələn balanın xallı kürəyi otların arasından arabir aydın görünürdü. Bala anasından üç-dörd addım aralı gəlirdi. Cüyür başını dik tutmuşdu. İri ala gözləri hey ətrafı axtarır, burnunun dəlikləri, qulaqları titrəyirdi. Gölə düşən cığıra dörd-beş addım qalmış cüyür durdu. Ətrafı iylədi. Birdən çevik bir sıçrayışla geri döndü. Otların arasında qeyb oldu.

Pusqudan çıxmadım. Bir papiros da yandırdım. Elə ikicə dəfə sümürmüşdüm ki, gördüm otlar yenə titrəşir. Heyvan görünmürdü. Ancaq bilirdim ki, nə isə gələn qaban sürüsüdür. Qabaqda gedən bələdçidən üç-dörd addım aralı, yeddi-səkkiz metrlik bir məsafədə otlar hey titrəşirdi. Payız girəndə qabanlar dəstə ilə gəzirlər. Cütləşmə vaxtı onların əti yaman iylənir. Ancaq yenə fürsəti əldən vermək istəmirdim...

Tüfəngi otun seyrəldiyi yerə tuşladım. Yenə gölə gedən cığıra dörd-beş addım qalmış sürü durdu. Aradan keçən bir-iki dəqiqə mənə bir il kimi uzun göründü. Birdən otların başı ləngər vurdu. Sürü baş alıb qaçdı.

Hava artıq açılmışdı. Atam yanıma gələ-gələ, hələ mənə çatmamış çığırdı:

– Bu nə işdir? Görəsən, heyvan nədən duyuq düşür? – Elə ki, yaxınlaşdı, gözü böyrümdəki papiros kötüklərinə sataşdı. Diqqətlə bir mənə, bir də sönmüş papiroslara baxıb dedi:

– Yaxşı ovçu papiros çəkməz. Mən də deyirəm heyvan nədən duyuq düşür!

*Əleviyyə Babayeva*

## QIŞA AZ QALIB

Çəkilib çəməndən, çöldən əl-ayaq,
Yenə yalqız qalıb neçə tarla, bağ,
Budaqdan üzülən hər sarı yarpaq
Deyir: qışa az qalıb.

Görünmür çöllərdə nə gül, nə çiçək...
Gah göy guruldayır, gah çaxır şimşək,
Xəzəli havaya sovuran külək
Deyir: qışa az qalıb.

Dağların başına düşür təzə qar,
İsti paltar geyir oğlanlar, qızlar,
Ağacdan dərilən axırıncı nar
Deyir: qışa az qalıb.

*Hüseyn Abbaszadə*



## QIŞ

*(N.Gəncəvidən)*

Qış fəslində bağ-bağatın təravəti gedər, göy qəndili sönər. Bağbanlar məhsulunu yığıb evə çəkilər, bülbüllər susar, qarğalar ağacların çılpaq budaqlarında belədən-belə uçmaqla, sanki "oğru var!" deyə iz itirməyə çalışarlar. Gülün ləçəkləri gedər, tikanları qaralar.

Səhər yeli suyun üzünü nəqqaş kimi narın həlqələrlə bəzəyər. Od söndürən, don gətirən şaxta öz şiddəti ilə suyu bıçaq kimi buza, Günəşin nizə şüalarını şehə döndərər. Qar-çovğunun və şaxtanın şiddətindən çaylar donar, təbiət başdan-başa tutqun kədər libası geyinər. Bədəndə qan donar, dağlar-dərələr qış libasına girər. Çöl heyvanları acından ora-bura vurnuxub yem axtarar, pusquda durub mal-qaranı parçalamaq istəyərlər. Bitkilər başını torpağa çəkib soyuqdan, şaxtadan gizlənərlər.

Havalar belə olanda şah otağının buxarısı yanar, otaq qış soyuğundan uzaq olardı. Buxarıdan qalxan alov havanı nizama salar, bu od niqab salmış göylər gözəli Günəşə bənzəyər.



Sərt qışın başlıca dəvası olan bu odu zərdüştilərin kükürd mədənində qana bulaşmış ipək parçaya bənzətmək olardı. Bu həmin oddur ki, fındıq kimi boz ağaclara innab rəngi verər. Buxarıda közərən od, parçalanmış nar dənələrinə, bəzən də tüstüyə tutulan kəhrəbaya bənzəyər. Od kənarında kömürlər ayna haşiyəsindəki ləkələr kimi görünər.

Od güclüdür. Buzu açıb, suyu zəncirdən xilas edən oddur. Od böyük, gözəl nemətdir. Heyf ki, ona münasib, mülayim ad verilməmişdir...

Qış fəslində insanlar yazın-yayın zəhməti, əkin-biçini, bağın, məhsulun bərəkəti sayəsində rahatlığa çəkilər, soyuq fəslin qar-boranından qorunarlar. Vaxtında yığdıqları azuqə ilə yaşayıb dincələrlər.

Zəhmət çəkənə rahatlıq ana südü kimi halaldır!

*İşləyəni Mir Cəlal*

## QIŞ GƏLƏNDƏ

Fəsillər içində qış gələn zaman
Narın yağış səpər yerə buluddan...
Tozdan xəstələnmiş dünyaya fələk
Sanki dərman verər rəhmə gələrək!
Geniş səmaların sərin şəbnəmi
Qurtarar istidən bütün aləmi.

Susamış otlara bağçada, bağda
Xırdaca buzlardan pay verər şaxta.
Hamıya bəxşişlər paylayan bağlar.
Tamam müflis olub, möhnətdə qalar...

Qaynayır kəndlinin evində küplər,
Kəndlilər kətan yox, yun paltar geyər.
Ceyran göbəyindən müşk saçılar,
Kabablı, noğullu süfrə açılar...

*Nizami Gəncəvi*



## QIŞIN NƏĞMƏSI

Saqqalı ağ, saçı ağ,
Əlində zorba çomaq
Gəldi qocalmış baba
Şaxta baba, qış baba.
Gurladı boğuq səsi
Uğuldadı nəğməsi:
"Ay uşaqlar, mən qışam,
Burda mənzil salmışam.
Mən gələndə qar yağar,
Onu sevər uşaqlar.
Qardan adam yaparaq,
Oynarlar qar-topalaq.
Soyuq qış axşamında
İsti ocaq başında
Nağıl deyir nənələr,
Qulaq asır nəvələr".
Çöldə ayaz, boran, qar,
Qışın da bir dövrü var...

*Abdulla Şaiq*



## ÜÇ QARĞA

Bir budaqda üç qarğa oturmuşdu. Qoca palıd ağacı uzun müddət onların qarıltısına qulaq asdı, axırda dedi:

– Hörmətli qarğalar, bəlkə siz çəmənliyə uçasınız?

Qarğalar çəmənliyə uçdular. Burada çəyirtkələrin vızıltısı altında çiçəklər başlarını yırğalayırdılar. Qarğalar bir təpəciyə qonub elə qarıldamağa başladılar ki, çiçəklər başlarını aşağı saldı, çəyirtkələr susdu, tüklü arı isə nəzakətlə dedi:

– Hörmətli qarğalar, bəlkə siz meşəyə uçasınız?

Qarğalar meşəyə uçdular.

Meşədə quşlar ötürdü. Onlar çox yerləri gəzdikləri üçün səyahət zamanı gördüklərindən danışırdılar. Hamı maraqla qulaq asırdı. Qarğalar isə yalnız özlərini dinləməyi sevirlər. Onlar elə qar-qar saldılar ki, dovşanların qulağı sancdı, boz qurd kar oldu, dələlər onların üstünə qoz qabığı yağdırmağa başladılar. Tülkü isə nəzakətlə dedi:

– Hörmətli qarğalar, bəlkə siz şəhərə uçub gedəsiniz?

Qarğalar uçub şəhərə gəldilər. Onlar bir evin damının kənarına qondular. Evin doqqazında üç qız oturmuşdu. Qızlar bir-birlərinə aman vermədən, üçü də birdən, ucadan danışırdılar.

Qarğalar bir-birlərinə dedilər:

– Bizim əsl yerimiz elə buradır ki, var.

Doğrudan bu dəfə onlara heç kim başqa yerə uçub getməyi təklif etmədi. Ancaq elə ki, onlar öz qarğa söhbətlərinə başladılar, qızların səsi quşların qarıltısını tamam batırdı.

Qarğalardan biri dilləndi:

– Yox, bu olmadı, mən heç özüm öz səsimi eşitmirəm!

Qarğaların üçü də havaya qalxdı, bu yerlərdən uçub getdilər.

*Valentina Oseyeva*



## TORAĞAY

Bağlar çılpaq qaldı, getdi isti yay,
Pəncərəm önündə boz bir torağay
Büküb qanadını büzüşmüş durdu,
Qarlı dimdiyini şüşəyə vurdu.
– Tuk, tuk!
Göydən qar tökülür, küləklər soyuq!
Açdım pəncərəmi ona taybatay,
Dedim:
– Gəl qoynuma, kiçik torağay!..
Pırıldayıb uçdu quş pəncərədən,
Sanki civildədi:
– Ürkək bir quşam,
İnsan nəfəsinə alışmamışam.
Qəmləndim, quşcuğaz uçub gedəndə,
Örtmədim bir müddət pəncərələri.
Elə zənn etdim ki, isti sinəmdə
Boş qaldı bu sabah bir körpə yeri.

*Mirvarid Dilbazi*

## QIŞ TƏTİLİNDƏ

Çingiz qış tətilində babası ilə kəndə gəldi. Atasının həmişə dilindən düşməyən doğma kənd doğrudan da gözəl idi. Qarşı-qarşıya dayanan uca dağların döşündə cərgələnən evlərin pəncərələri bir-birinə tamaşa edirdi. Dağların arasından qıvrılıb axan çay kəndi iki yerə bölürdü. Çayın hər iki sahili ilə salınmış meyvə bağları, nəhəng palıdlar və söyüdlər dağların ətəyinə kimi uzanırdı. Yuxarı zirvələrdəki sıldırım qayaların başı çoxdan qarla örtülmüşdü.

Çingiz gah dağların sinəsindən qalxıb çay üzərində ləngər vuran qartallara, gah da dolama asfalt yolun kənarındakı çapıq qayalara nəzər salırdı...

Nəhayət, maşın ikimərtəbə[1] ağ evin yanında dayandı. Çingiz maşından düşən kimi nənəsinin qucağına atıldı. Sevimli nəvəsini bağrına basan qarı onu duz kimi yalamağa başladı:



– Gəlmədin, gəlmədin, gələndə də qışda gəldin, qurbanın olum!

Çingiz elə bil nənəsinin sözlərini heç eşitmirdi. Onun fikri qəfil gördüyü qəribə mənzərələrdə idi. Burada hər şey Çingizə qeyri-adi gəlirdi. Buna görə də onun evə girməyi ilə çıxmağının arası çox çəkmədi. Çingiz özünü tələsik bağa saldı. O, gah əlini quruyub budaqlara yapışan əzgillərə, gah da heyva ağaclarına doğru uzadırdı. Uca çinar ağacının başındakı köhnə yuva da Çingizin gözündən yayınmadı. Xırda çırçırpı ilə örtülmüş iri yuva tərsinə çevrilmiş çoban papağını xatırladırdı. Çingiz bir anlığa bu yuvadan pərvazlanan bala quşları xəyalına gətirdi və kəndə gec gəldiyinə heyfsiləndi...

Ağacların başında qalan tək-tük solğun yarpaqlar yerlərindən qopur, küləyin qabağında uzaqlara uçur, bəziləri isə çəpərin tikanlarına ilişib qalırdı. Soyuqdan büzüşən sərçələr budaqların arasında gecələmək üçün özlərinə yer seçirdilər. Artıq qaranlıq qovuşurdu. Çingiz yenicə sudan gəlib özünü tələsik tövləyə salan heyvanlara da yaxşı baxa bilmədi. O, həyətdə bir əməlli-başlı gəzməmiş əl-ayaq yığışdırıldı. Hava qaraldı. Otaqda yanan elektrik lampasının gözqamaşdıran işığı pəncərədən həyəti işıqlandırdı. Hava soyuq olduğundan içəridə yanan dəmir peçin gurultusu adama ləzzət verirdi.

Nənəsinin kənddən, babasının isə şəhərdən başladıqları söhbətlər Çingizi o qədər də maraqlandırmırdı. Onun fikri özü ilə gətirdiyi kiçik tüfənglə sabah vurub yerə salacağı boz sərçələrdə və nişan alan kimi qaçıb getmiş ala sağsağanda idi.

Dəmirqara odunun istisindən xumarlanan Çingiz tez yuxuya getdi. O, səhər başlanmış səs-küyə yuxudan kal durdu. Yatağından qalxmamış pəncərədən çölə baxdı: hər yer süd kimi dümağ idi. Tələsik geyinib bayıra çıxdı. Təzə yağmış qarın işığı gözlərini qamaşdırdı. Çingiz gördüyü mənzərəyə təəccüb etdi. Bir gecənin içində yerə nə qə-

dər qar yağmışdı! O, tövləyə sarı getdikdə əlində sərnic gətirən nənəsi ilə qabaqlaşdı. Evdən tövləyə kimi açılmış dar çığıra bir adam güclə sığırdı. Çingiz nənəsinin yanından keçmək istəyəndə bir ayağı qara düşdü. Rezin çəkməsinin boğazından içəri dolan qar baldırını göynətdi.

– Başıma xeyir, ay bala, bu soyuqda niyə durdun? – deyən nənəsinə əhəmiyyət verməyən Çingiz yüyürüb tövləyə girdi. Ona zülmət kimi görünən tövlədən babasının səsi gəldi. Çingiz bir müddət içəridə heç bir şey seçmədi. Fısıldaya-fısıldaya ot yeyən heyvanlar başlarını qaldırıb qapıya boylandılar. Qızıl inəyin, qara camışın və sarı buzovun qaranlıqdan parlayan gözləri Çingizi qorxutdu. Az sonra onun gözləri tövlənin qaranlığına alışdı. Hər şey aydınlaşdı. Çingiz boz çatı ilə küncə bağlanmış körpə buzovu gördü. Yavaş-yavaş ona yaxınlaşdı. Balasının nazını çəkən Qızıl inək Çingizə baxıb imrəndi. Elə bil "Balama yaxın getmə" deyirdi.

– Buzova yaxın getmək olarmı? – deyə Çingiz babasına müraciət etdi.

Babadan – "olar!" sözünü eşitdikdə o, əlini buzovun ağzına apardı. Buzov başını Çingizə tərəf uzatdı. Onun isti və sürüşkən dili Çingizin buza dönmüş barmaqlarını isitdi. Az sonra Çingiz lap yaxın gəlib onun başını, boynunu, belini tumarlamağa başladı. Buzovun indicə anasının dili ilə daranıb təmizlənmiş beli Çingizin əlinin altında məxmər parçanı xatırladırdı. Artıq Çingiz Qızıl inəyin, qara camışın başlarını tumarlamaqdan doymur, onlara çəngə-çəngə ot verirdi.

Çingizin axşamkı planları pozulmuşdu. İndi nə ağacların başındakı quru meyvələr, nə də uca çinardakı yuva görünürdü. Boz sərçələr isə qarı kürünmüş cığırlara tökülüb dən axtarırdı. Çingiz indi quşlara güllə atmaq istəmirdi. Əksinə, nənəsinin toyuq dənindən ovuclayıb onlara səpdi. Dünənki ala sağsağan da gəlmişdi. Bütün gecəni yağan güclü qar hər yeri tutmuşdu. Qırmızı kirəmitli evlər, qayalı dağlar, iri qol-budaqlı ağaclar tamamilə qarla örtülmüşdü. Bacalardan burula-burula qalxan boz tüstülər göyə





çəkilib gözdən itirdi. Evlərin üstündəki radio və televiziya antenaları qara sancılmış nazik çubuq kimi güclə seçilirdi. Çingiz həyətdəki odunların üstündəki qarın qalınlığını qarışlayıb ölçürdü...

Təzəcə seyrəlmiş buludlar arasından boylanan günəş qarın üzünü daha da işıldadırdı. Çingiz babası ilə qar topalarına oxşayan kolluğa tərəf gedirdi. O, nənəsinin hörüb hazırladığı ağ yun əlcəkləri əlinə geymiş, qulaqlı papağını gözünün üstünə qədər basmışdı. Dizlərinə qədər çəkdiyi ip corab rezin çəkmələrindən də xeyli yuxarıda dururdu. Çingiz kiçik tüfəngini döşünə basıb babasının açdığı izlərlə irəliləyirdi. Hərdənbir büdrəyib qara yıxılsa da yenə ondan dala qalmırdı.

Qoşalüləni boynundan asan babanın gözləri qabaqda olsa da, fikri arxasınca addımlayan nəvədə idi. Təpəyə qalxanda qoca ayaq saxlayıb, xoş təbəssümlə nəvəsinin üzünə baxdı. Çingiz də altdan-yuxarı babasına tərəf boylandı. Qoca təpənin o biri üzündə, qıraqlarını qar basmış gölü

əliylə göstərərək:
– Bax, o gördüyün göl Cüyür gölüdür!
Çingiz:
– Baba, burda indi də cüyür varmı? – deyə soruşdu.
– Əlbəttə var, bala, bax, o taydakı quzeydə cüyür olur!
– Baba, gedək oraya, görək cüyür tapırıqmı?
Baba qımışdı:
– Yox, indi mümkün deyil, orada qara batarıq.
– Baba, mən qar əriyəndə də gələcəyəm.
– Gəl, bala, o vaxt sənə özüm cüyür balası taparam...

Baba ilə nəvə kənddən xeyli uzaqlaşdılar. Göyün üzü yenidən buludla örtülməyə başladı. Dağların başına çökən duman yavaş-yavaş aşağılara enirdi.

Birdən kolun dibindən uçmaq istəyən turacın səsi onları dayandırdı. Turac uzağa uça bilməyib qabaqda qara düşdü. O, təzədən qalxmaq istədisə də bacarmadı. Qanadlarını çırpıb yumşaq qarı göyə sovurur, daha da batırdı. Həniri duyan quş qorxub özünü gizlətmək üçün başını qarın altına soxmağa çalışdı. Ancaq hələ də onun qanadları görünürdü.

Qoca əyilib turacı götürdü. Cibindən çıxardığı yaylıqla onun ayaqlarını bağladı.

Nəvənin sevinci yerə-göyə sığmırdı.

O, sevinə-sevinə əlini quşun qanadları üstündə gəzdirir və elə bil onun tez-tez döyünən ürəyinin səsini eşidirdi. Çingiz quşu evə tez çatdırmaq istəyirdi. Buna görə tələsik babasına dedi:
– Baba, daha gəl qayıdaq.

Bu təklif babanın ürəyindən oldu. Çünki nəvəsi qarlı havalara hələ öyrəşməmişdi. O, soyuqlaya bilərdi. Onlar evə döndülər.

Çingiz yol boyu fikrində turacı şəhərə aparıb, məktəbin təbiət dərnəyinə verəcəyini qət edirdi.

*Səmistan Əsgərov*



## QIŞ

Göydən yerə sanki enir bərəkət,
Hər dənəsi qızıl şanı, qızıl nar.
Onun buzlu nəfəsində hərarət,
Əllərimiz soyuğunda qızınar.



Qar üstündə cığır açan, yol açan
İşə gedən insanların izidir.
Odunçular nəfəsiylə bu zaman
Çılpaq qalan budaqları isidir.
Günəş doğur.
Gülümsünən dağların
Yavaş-yavaş güney yeri açılır.
Elə bil ki, ağ kürk geyən dağların
Yaxasının düymələri açılır.



Şəfəqlərdən saçlarına düşür dən,
İlk baharın nəfəsini duyur o.
Payız vaxtı xəzəllərə bürünən
Təbiətin əl-üzünü yuyur o.

*Məmməd İsmayıl*

## QAR

Qar düşür lopa-lopa
Bulaqların, göllərin
Bağrına hopa-hopa...

Qar gəlir narın-narın
Bir ağ göyərçin kimi
Qonur üstə yolların...

Qar yağır yığın-yığın,
Qucaqlayır köksünü
Mürgüləyən torpağın...

*Məmməd Faiq*



## KƏNDLİ İLƏ QIŞIN DOSTLUĞU

Biri var idi, biri yox idi. Keçmiş zamanlarda bir kəndli var idi. Bu kəndlinin bir ala inəyi və üç keçisi var idi. Özü də kəndin lap qurtaracağında, dağın döşündə yaşayırdı. Kəndli həmişə işini ehtiyatlı görürdü. Vaxtında meşədən odun gətirir, inəyi və keçiləri üçün ot biçib toplayır, dənini üyüdüb çuvallara doldururdu. Bütün işlərini bitirdikdən sonra qışı gülərüzlə qarşılayırdı. Bir il dedilər ki, qış lap bərk gələcək. Kəndli yenə də öz ehtiyatını qabaqcadan görüb qurtarmışdı. Arxayınlıqla qışı gözləyirdi. Birdən qış ona qonaq gəldi. Kəndli onu lap layiqincə qarşıladı, motal pendirinə və keçi südünə qonaq elədi. Kəndli ilə qış yamanca dostlaşmışdılar. Bir neçə gündən sonra havalar qızmağa başladı. Qonaq qış köçüb getməli oldu. Kəndli üstəlik öz kürkünü qışa bəxşiş verdi. Qış kəndlidən ayrılanda utana-utana dedi:

– Əziz dostum, heç bilmirəm sənin bu yaxşılığından necə çıxım?

Kəndli ehtiramla baş əyərək:

– Dost-dostun sağlığını istər, – dedi.

Qış:



– Onda mən sənə ancaq bir yaxşılıq edə bilərəm. Gələn il öz gəlişimi sənə əvvəldən xəbər edərəm ki, soyuqlara yaxşı hazırlaşa biləsən.

Onlar öpüşüb ayrıldılar. Həmin gündən kəndli ilə qışın dostluğu başlandı.

Qışın ardınca yaz gəldi. Ağaclar çiçək açdı. Köçəri quşlar qayıdıb gəldilər. İstilər düşdü. Hər yerdə qızğın iş başladı. Qonşular meşədən odun gətirdilər. Mal-qara üçün ot biçdilər. Taxıllarını üyüdüb yığdılar. Ancaq qışla dost olan kəndli yerindən tərpənmədi. Bütün günü tənbəl-tənbəl evdə yeyib yatdı.

Günlər gəlib keçdi. Havalar soyumağa başladı. Ağacların yarpaqları saralıb töküldü. Ancaq kəndli yerindən tərpənmədi. Qonşu kəndlərə və dağlara qar yağdı. Kəndli yenə də arxayın yatdı və qışın sifarişini gözlədi.

Axırda bir səhər durub gördü ki, qalın qar yağıb. Dostu qış da əlində əsa, çiynində kürk dayanıb qapının ağzında. Kəndli dostu ilə öpüşüb görüşdü. Onu içəri dəvət etdi. O, qışı qonaq etmək üçün əl-ayağa düşdü. Süd üçün inəyin yanına getdi.

– Ay mənim qızıl inəyim, əziz qonağım gəlib, səndə süd olarmı sağım?

İnək yazıq-yazıq sahibinin üzünə baxaraq dedi:

– Sən mənim üçün ot gətirmisənmi? Axı mən neçə gündü ki, acam.

Kəndli keçilərin yanına cumdu. Keçilərdən də eyni cavabı aldı.

Kəndli ot üçün qoruğa qaçdı. Hər tərəf qar olduğundan bir dənə də olsun ot görə bilmədi...

– Ay otlar, haradasınız, heyy?!. Axı, mənim inəyim acdır. Sizi biçməyə gəlmişəm.

Otlar dedilər:

– Biz qarın altında qalıb soyuqdan donmuşuq, bizi gərək yayda biçəydin.

Kəndli kor-peşman evə qayıtdı. İstədi ocaq qalayıb qo-

naq üçün çay qaynatsın. Odun damına getdi. Gördü ki, odun damı bomboşdur.

– Ay odun damı, niyə boşsan?

Odun damı baş endirib dedi:

– Axı sən bu il mənə odun gətirməmisən. Get meşədən xahiş elə, sənə odun versin.

Kəndli balta götürüb meşəyə getdi.

– Ay meşə qardaş, mənə odun verərsənmi?

Meşə sakit duraraq hirsindən cavab vermədi. Kəndli bir bağlama çırpını tovlayıb evə qayıtdı. İstədi qonaq üçün xaşıl bişirsin. Un çuvalının yanına gəldi.

– Ay un çuvalı, unun olarmı?

Un çuvalı bükülüb küncə qoyulmuşdu. O inildəyərək cavab verdi:

– Axı məni bu il dəyirmana aparmayıbsan.

Kəndli bir az buğda götürüb dəyirmana qaçdı.

– Ay dəyirman qardaş, mənim buğdamı üyüdərsənmi?

Dəyirmandan səs çıxmadı. Çünki onun suyu şaxtadan donmuşdu.

Kəndli buradan da kor-peşman evə qayıtdı. Gileylənərək qışa dedi:

– Ay qış baba, heç belə də dostluq olarmı? Axı sən mənə söz vermişdin ki, gələndə sənə qabaqcadan xəbər verəcəyəm.

Qış ağ buzdan olan dişlərini parıldadaraq güldü və dedi:

– Mənim əziz dostum, bütün ağacların yarpaqlarını tökdüm, tərəvəz və bostan tağlarını şaxta ilə soldurdum, nəhayət, sizin qonşu kəndlərə qalın qar yağdırdım. Məgər bunlar xəbərdarlıq deyilmi?

Kəndli utandığından başını aşağı salıb dinmədi. O, öz səhvini ancaq indi başa düşmüşdü.

*Əli Səmədli*



**İLK QAR**

Mən meşədə quşlar üçün
Qalan sövqat barı gördüm.
Getmişdim ki, xəzəl görəm,
Lopa-lopa qarı gördüm.

Həmərsinin muncuğunda
Donub qalan arı gördüm.
Zoğalın tumurcuğunda
Gizlənən baharı gördüm.

Qar ələndi yamaclara,
Sanki süd qozalı deşdi,
Meşədəki ağaclara
Buludlar nağıl danışdı.

*Rafiq Yusifoğlu*

**QIŞ DA GÖZƏLDIR**

Örtüb hər yeri
Qar narın-narın,
Mavi gözləri
Gülür çinarın.

Həsrətlə baxır
Xallı turaclar,
Sanki darıxır
Yalın yamaclar.

Qoca palıd da
Durur vüqarla,
Sanki qovuşub
Xoş arzularla.

Soyuq olsa da
Qızır yanaqlar.
Sevinclə dərsə
Gedir uşaqlar...

Ana yurdumun
Baharı kimi,
Deyin qışı da
Gözəl deyilmi!..

*Azad Talışoğlu*



## QAR DƏNƏSİNİN SƏRGÜZƏŞTİ

Qarlı qış günlərinin birində pəncərənin arxasında dayanıb çölə tamaşa edirdim. Qar dənələri rəqs edə-edə divarlara, kollara, ağacların budaqlarına, bir sözlə, hər şeyin üzərinə qonurdu. Elə bu an iri bir qar dənəsi pəncərəyə tərəf gəldi. Əlimi bayıra uzadıb Qar dənəsinin altına tutdum, astaca gəlib ovcumun içinə düşdü. Necə də ağ və şəffaf idi! Elə bil üzərində sənətkar əli işləmişdi. Öz-özümə:

– Kaş, – dedim – Qar dənəsinin dili olaydı, öz sərgüzəştini mənə danışaydı.

Buna bənd imiş kimi Qar dənəsi dilə gəldi:

– Mənim sərgüzəştimi eşitmək istəyirsənsə, qulaq as, danışım. Mən bir neçə ay əvvəl su damlası idim. Xəzər dənizində milyard-milyard su damlaları ilə o yan-bu yana getməklə günlərimi keçirirdim. Yay günlərindən birində dənizdə gəzişirdim. Günəş bərk isti saçırdı. İstinin təsirindən qızışıb minlər, on minlərlə damla ilə birlikdə buxara çevrildim.

Biz yüngüllükdən qanad taxıb yuxarılara uçurduq. Külək də arxamızca düşüb bizi istədiyi tərəfə qovurdu. O qədər yuxarı qalxdıq ki, axırda adamlar gözümüzdən itdi.



Hər tərəfdən buxar kütlələri gəlib bizə qovuşurdu. Bəzən də biz gedib daha böyük buxar kütlələrinə qovuşurduq; bir-birimizə qovuşub yol gedirdik, getdikcə sıxlaşır, çoxalır, çoxaldıqca da yuxarılara,ənginliklərə uçurduq. Bəzən günəşin üzünü örtürdük, bəzən də ay və ulduzların qarşısını kəsirdik. Gecəni daha da qaranlıqlaşdırırdıq. Buxar zərrələrinin bir çoxu deyirdi:

– Artıq biz bulud olmuşuq!..

Külək bizi cürbəcür şəkillərə salırdı. Hələ mən özüm dənizdə yaşayanda buludları müxtəlif şəkillərdə: insan, dəvə, hətta uzunqulaq şəklində görmüşdüm.

Göydə neçə ay sərgərdan qaldığımızı bilmirəm. Çox hündürdə idik, hava soyumuşdu. Bir-birimizə o qədər sıxlaşmışdıq ki, ətrafı görmür, haraya getdiyimizi bilmirdik. Günəş görünmürdü. Elə bil günəşin qabağını kəsmişdik.

Buludun eni-uzunu bir neçə yüz kilometr olardı. Yağış olub yerə qayıtmaq istəyirdik. Yerin həsrətilə ürəyim bir tikə olmuşdu. Bir müddətdən sonra yarısu, yarıbuxar halına düşdük. Az qalırdı yağışa çevrilək. Birdən hava elə soyudu ki, mən də, yoldaşlarım da titrədik. Ətrafıma nəzər salıb yoldaşlarımın birindən soruşdum:

– Nə olub?

Belə cavab verdi:

– İndi başqa yerlərdə havalar isti olsa da, bizim olduğumuz yerlərdə qışdır. Bu gözlənilməz soyuq bizi yağış olmağa qoymayacaq... Bircə mənə bax! Mən qara dönürəm, elə sən özün də...

Yoldaşım sözlərini qurtara bilmədi. Qara dönüb yerə enməyə başladı. Onun ardınca mən də, minlərlə mənim kimi zərrələr də bir-birinin ardınca qara dönüb yerə yağmağa başladıq.

Dənizdə olanda ağır idim. Ancaq indi çox yüngülləşmişdim. Qov kimi uçurdum. Ona görə ki, soyuq iliklərimə işləmişdi. Rəqs edə-edə yerə gəlirdim. Elə ki, yerə yaxınlaşdım, gördüm Təbriz şəhərinə düşürəm. Xəzər də-

nizindən nə qədər uzaqlaşmışdım. Yuxarıda olarkən bir uşağın fağır bir iti döydüyünü gördüm. İt aldığı zərbələrdən yazıq-yazıq zingildəyirdi. Gördüm ki, yerə bu vəziyyətdə yaxınlaşsam, düz həmin zalım uşağın başına düşəcəyəm. Küləkdən xahiş elədim ki, məni başqa yerə aparsın, uşağın başına düşməkdən xilas olum. Külək xahişimi qəbul edib, məni buraya gətirdi. Əlini altıma tutduğun üçün səndən xoşum gəldi...

Nəhayət, Qar dənəsinin səsi kəsildi. Baxıb gördüm ki, suya dönüb...

*Səməd Bəhrəngi*



## QIŞ

Dəyişir dünyanın mənzərələri,
Qış gəlir öz qarı, yağışlarıyla
Kiçik otağımın pəncərələri
Çözənir şaxtanın naxışlarıyla.

Yağır qış göyünün ağ çiçəkləri,
Yağır asta-asta, səpilir yola.
Ağbirçək dağların ağ ləçəkləri
Bəyaz zirvələrdə dönür xəyala.

*Çingiz Əlioğlu*





## ZƏRİFƏ

Yol üstə bir qız durur,
Gözünü ovuşdurur.
Onu yıxıblar qara,
Nə deyim uşaqlara!
Ağlama, ay Zərifə,
Sən gəl küsmə bu dəfə,
Bu qış vaxtında heç kəs
Zarafatdan inciməz.
Bil ki, yağan zaman qar
Belə şeylər çox olar!

*Tofiq Mahmud*

## BU BULUD

Bu bulud analıdı,
Saçları xınalıdı.
Ətəyində yağış var,
Lalələrin xalıdı.

Bu bulud lap quzudu,
Donu da qırmızıdı.
Dolaşır zirvələrdə,
Bu dağların qızıdı.

Bu bulud lap qarıdı,
Özü aydan arıdı.
Haçansa itkin düşmüş
Çayların damarıdı.

Bu bulud bərəkətdi,
Bir əsim mehə bənddi,
Külək dəydi xətrinə,
Uçub bəs hara getdi?

Bu bulud göbələkdi,
Bulud içində təkdi.
İki dağ arasına
Yağışdan çəpər çəkdi.

*Zülfüqar Şahsevənli*



## QIŞ DEYİR

Saqqalı ağ, saçı ağ,
Ağaca dayanaraq
Gəldi qocalmış baba,
Şaxta baba, qış baba.
Ucaldaraq səsini,
Oxudu nəğməsini:
“Mən gələndə yağar qar,
Məndə min cür oyun var.
Şirin qar-qar oyunu,
Sevər uşaqlar bunu.

Qarlı bir qış axşamı
Xoşdur yolka bayramı.
Məndə nələr var, nələr!
Sevər məni nənələr.
Körpələr də beşikdə,
Sevər məstan pişik də.
Soyuq qış axşamında
İsti soba yanında
Nağıl deyər nənələr,
Qulaq asar nəvələr.

*Nigar Rəfibəyli*





# NAĞILLAR ALƏMİNƏ SƏYAHƏT



## ŞİR VƏ TÜLKÜ

Başı buluda çatan Şah dağının ətəyində qalın bir meşə vardı. Meşə cürbəcür heyvanlar və quşlarla dolu idi. Bu meşədə caynaqlı bir Şir şahlıq eləyirdi. O öz-özünə bitib-tökülən meyvələrdən birinə də dilini vurmur, ova gedir, təzə ət yeyirdi. Şir yatıb yuxuya gedəndə belə heyvanlar ondan gen gəzir, göydəki quşlar qanad salırdı.

Bir gün Şah dağının Şiri ova çıxdı, çox gəzdi, çox dolandı, ancaq əlinə heç nə düşmədi, bütün gecəni ac yatdı. Sabahı açıb yenə ova getdi, bü dəfə onun pəncəsinə şələquyruq bir Tülkü keçdi.

Qəzəbli Şir dişlərini qıcadı:

– Yeyəcəyəm səni!.. Bəs bu neçə gündə harada itib batmışdın?

Tülkü başını Şirin iti caynaqlarına tərəf əydi:

– Xalamgilə getmişdim!

– Niyə getmişdin xalangilə?

– Xalama deyəm ki, mənə xoşbəxtlik üz veribdir.

– Nə xoşbəxtliyi?

– Bəs yuxuda görmüşəm ki, Şah dağının şahına qismət olmuşam!



Ağzı köpüklənən Şir bar-bar bağırdı:

– Yalan deyirsən! Gözlərinin içinə, bəbəyinin ortasına qədər yalan deyirsən!

– Şahın öz başına and içirəm!

– Mən səni indicə parçalayacağam!..

Şələquyruq Tülkü Şirin pəncələrini tumarlayıb, dabanlarını yaladı:

– Qurd-quşa yem olmaqdansa, şaha xörək olmaq mənə xoşdur! Mən anadan gör necə xoşbəxt doğulmuşam ki, Şah dağının böyük şahına yem oluram!

Şələquyruq Tülkünün yağlı dili qəzəbli Şirin ürəyinə yatdı:

– Bəs mən səni parçalamasam necə?

Tülkü əlləri üstə dikəldi:

– Yox, siz məni yeyin!.. Axı siz acsınız!

– Əgər səni bağışlasam, necə?..

– Onda ömrüm uzunu sizin qulunuz ollam!

Şələquyruq Tülkünün sözləri Şirin xoşuna gəldi, Tülkü sağ qaldı. Getdikcə Şirin qılığına girdi, onun ürək dostu oldu. Şirin mağarasını öz yumşaq quyruğu ilə silib-süpürdü, itaətində durub bir sözünü iki eləmədi...

Şir hər nə ovladısa, gətirib süfrəyə tökdü. Şələquyruq Tülkü Şirin bol süfrəsindən doyunca yedi. Ağası başını qoşa pəncəsinin üstünə qoyub istirahət edəndə, şələquyruq Şirin misilsiz igidliklərindən söz açdı, basıb-bağladı, olanı-olmayanı onun adına yazdı.

Vaxt dolandı, vədə ötdü, bir gün Şir ovdan yaralı döndü... Tülkü Şirin yüngül yarasına baxıb gözlərindən qanlı yaş axıtdı. Tezcə də şahın yarasını yüngülcə bağladı. Bir müddət sonra yarası sağalan Şir yenə də ova çıxdı. Bu dəfə ağır yaralanan Şir mağarasına qayıtdı.

Tülkü diqqətlə yaralı Şirə baxıb, bu yaradan da birtəhərlə ölməyəcək deyə, yenə də ağasına qulluq göstərdi, birbaşa Şirin pəncələrinə sərildi:

– Məni yeyin, şahım! Siz ac qalmayın! Qoyun bu dəfə arzuma çatım!..

Şir necə ac olsa da Tülkünün tükünü də tərpətmədi. Sınaqlardan çıxan şələquyruq Tülkü Şah dağı şahının vəziri oldu. İndi daha artıq ərklə Şahın süfrəsindən yedi, içdi, get-gedə yağlanıb şişdi.

Bir gün Şir Şah dağının ətəyində qılınclı-qalxanlı bir pəhləvanla üzləşdi, çox ağır yara aldı, sürünə-sürünə mağarasına gəldi. Bu dəfə də Tülkü zəndlə Şirə baxdı, baxdı: "Yox, daha yüz canı olsa, biri də qalxa bilməz!" – dedi. Tülkü çevik tərpənib heydən düşən Şirin başının üstünü aldı.

Ağır yaradan ürəyi od tutub yanan Şir dostunu səslədi:

– Su!.. Mənə bir qurtum, su!..

Toy-bayram edən Tülkü, caynaqları boşalan Şirin ağzını əydi:

– Sən kimdən su istəyirsən, kaftar?

– Səndən başqa bu Şah dağında mənim kimim vardır?!

– Sən məni özünə əbədi nökərmi tutmuşan?!

– Məgər sən bir zaman mənim bu pəncələrimə sərilib demirdinmi "qulunam?"

Şələquyruq iri bir daşı qucaqlayıb üstdən aşağı Şirin yarasına çırpdı:

– O vaxt mən sənin qulun olsam da, indi sən mənim ayaqlarımın çulusan!...

Tülkünün kəmfürsətliyini görən caynaqlı Şir öz dirsəyini yerə dayayıb axırıncı dəfə sifəti üzə çıxan Tülkünün cəzasını vermək istədi. Tülkü isə sıçrayıb mağaranın qayalarına qalxdı, əlini-əlinə vurub qəhqəhə ilə güldü:

– Bu neçə müddət ərzində mən sənin dərini gözləyirdim, sarsaq! Yoxsa mən əzəl gündən sənin atanın nökərizadı deyildim!..

Kim bilir, bəlkə də Şah dağı Şirinin ağır yarası sağalaçaq, o dizlərinə dayanıb ayağa qalxacaqdı!.. Ancaq Şir daha qalxmadı. Pəhləvanın qılınc yarası yox, şələquyruq Tülkünün dil yarası onu bir daha qalxmağa qoymadı...

*Süleyman Rəhimov*





**ŞİR VƏ SİÇAN**

Şir yatırdı. Siçan qaça-qaça gəlib onun üstünə çıxdı. Şir oyanıb siçanı tutdu. Siçan yalvarmağa başladı ki, şir onu buraxsın. O, şirə dedi:

– Əgər sən məni buraxsan, mən də sənə yaxşılıq edərəm.

Şir siçanın bu vədinə güldü və onu buraxdı.

Bundan bir qədər sonra ovçular şiri tutub iplə ağaca bağladılar. Siçan şirin nəriltisini eşidib qaça-qaça onun yanına gəldi, ipi çeynəyib qıraraq onu xilas etdi və dedi:

– Yadındadırmı, sən gülürdün, ağlına gətirmirdin ki, mən sənə yaxşılıq edə bilərəm. İndi görürsən ki, siçan da bəzən yaxşılıq edə bilir.

*Lev Tolstoy*

**AT VƏ EŞŞƏK**

Heç bir yükü olmayan gözəl, güclü bir at ilə ağır yüklənmiş bir eşşək sahiblərinin ardınca yolla gedirdilər.

Eşşək dedi:

– Ay mehriban at, gəl mənim yükümdən heç olmasa bir azca götür, mən yükün altında lap əldən düşmüşəm!

At lovğalıqla onun sözünü rədd etdi. Yazıq eşşək ah çə-

kib qulaqlarını salladı, yoluna davam etdi. Amma güc ilə bir verst də yol gedib, lap əldən düşdü və yıxılıb öldü.

Onların sahibi ancaq indi başa düşdü ki, yazıq heyvana nahaq zülm edib: güclü, cavan atı boş yerə belə əzizləmişdir. O, qəmlənib öz-özünü danladı, amma başqa çarəsi yox idi. Gərək yoluna davam edib gedəydi.

O, eşşəyin bütün yükünü lovğa ata yüklədi və üstəlik eşşəyin dərisini də yolda qoyub getmək istəmədiyindən, onu da soyub yükün üstünə atdı.

*Konstantin Uşinski*

## ƏDALƏTLİ PADŞAH

Bir padşah ova getmişdi. Günorta zamanı onlar xörək yeməyə əyləşdilər. Yaddan çıxıb özləri ilə duz götürməmişdilər. Padşah buyurdu ki, bir adam gedib yaxındakı kənddən pulla duz alsın.

Vəziri dedi:

– Ey padşah, bir ovuc müftə alınan duzdan kəndə nə zərər toxunar?

Padşah buyurdu ki, ədalətsizlik ən əvvəl az şeylərdən baş verir, bir şey az da olsa, çox da olsa, gərək sahibinə əvəzi çatsın.

*Rəşidbəy Əfəndiyev*

## BÜLBÜL VƏ LEYLƏK

Qədim zamanlarda olduqca gözəl, qalın bir meşə vardı. Quşlar bu meşəyə toplaşıb nəğmə oxuyurdular. Hərənin bir peşəsi, sənəti vardı. Gündüzlər işləyər, gecələr də şənlik edərdilər.

Bülbül və Leyləyin əlindən heç nə gəlmirdi. Bir gün Bülbül Leyləyə dedi:

– Görəsən, biz də bir sənət öyrənə bilərikmi?

Leylək ahəstə-ahəstə dilləndi:



– Eh, işləmək nəyimizə lazım? Bir də bizə kim sənət öyrədər axı? Elə belə yaxşıdır.

Bülbül Leyləyin tənbəlliyini bilirdi. Ona görə də təkid elədi:

– Yox, biz bir peşə öyrənməliyik. Elə günü sabahdan çıxaq səyahətə, uçub gedək bağlı-bağatlı kəndlərə, şəhərlərə. Bağlarda gecələrik, xoşumuza gələn peşəni öyrənərik.

Leylək də candərdi ona qoşulmağa razılıq verdi.

Bülbül və Leylək xeyli uçub gözəl bir kəndə çatdılar. Kəndin yaşıllığı, həyətlərin gül-çiçəyi Bülbülün çox xoşuna gəldi. Ən gözəl bağlardan birini göstərib dedi:

– Gəl, bu bağa, qızılgüllər arasına qonaq. Görünür, buranın adamları gözəl peşə sahibləridir. Burada nə görüb-eşitsək, onu da özümüzə peşə edərik.

Razılaşdılar.

Qızıl günəş dağ dalına aşdı. Bağlara, bağçalara sərinlik çökdü. Bülbül pəncərənin qabağındakı qızılgülə qondu. Leylək isə böyük bir armud ağacının lap kəlləsində yerini rahatladı.

Qaş qaraldı. Lampalar yandı. Hamı mal-qarasını yerbəyer elədi. Əl-ayaq çəkildi.

Bir azdan gözəl, yaraşıqlı bir otaqda məclis quruldu. Çalıb-çağırmaq səsi aləmi götürdü. Gənc bir müğənni şirin, məlahətli səsi ilə dinləyəni heyran qoyurdu. Yorulmadan oxuyurdu. Bülbül gözünü qırpmadan musiqini dinləyirdi. Arabir özü də eşitdiyi zənguləyə bənzər cəh-cəh vururdu. Deyəsən, qismətinə məlahətlə oxumağı öyrənmək düşmüşdü.

Bülbül dostunu xatırladı. Tez onun yanına uçdu. Leylək çoxdan şirin yuxuda idi. Bülbül onu oyatdı:

– Qulaq as, – dedi, – sən də bir şey öyrənərsən!

Leylək yuxulu-yuxulu gözlərini ovuşdurub:

– Eh, mən səhər tezdən qalxıb öyrənəcəyəm, – dedi.

Bülbül yenə qızılgüllər arasında gözdən itdi. Şən, şirin cəh-cəhi ilə musiqini daha da rövnəqləndirirdi.



Musiqi məclisi gecənin yarısınadək çəkdi. Bülbül mahir musiqiçilərin, müğənnilərin avazını eşidib öyrəndi. Hamı yatandan sonra qızılgül kollarının arasında şirin cəh-cəhi ilə şən nəğmələr oxudu.

Leyləyi sübh tezdən həyət qapılarının taqqıltısı oyatdı. Hansı həyətə uçdusa ancaq taqqıltı səsi eşitdi.

Adamlar doqqaz qapısını açıb mal-qarasını çölə ötürürdü. Başqa bir şey görüb-eşitməyən Leyləyin öyrəndiyi "tak-tak" oldu.

Quşlar öz doğma meşələrinə qayıtdılar. Bülbülün nəğməsi gül-çiçəkliyi başına götürmüşdü. Bütün heyvanlar, quşlar səsini kəsib onu dinləyirdilər. Bülbül harada oxusa oraya axışırdılar. Onu görmək istəyirdilər.

Leylək isə tək-tənha, uca bir dirəyin üstünə qonub, hərdənbir səslənirdi: tak-tak, tak-tak.

*Əjdər Ağayev*

## GÜZGÜ

Dovşan yoldan bir güzgü tapdı. Güzgüdə özünü görüb elə bildi ki, şəkildi.

– Qəşəng bir şəkil tapmışam, lap qəşəng! – deyə səs-küy saldı.



Ceyran güzgünü alıb baxdı:

– Doğrudan da gözəldir. Siz onun bir buynuzlarına baxın. Lap mənimkinə oxşayır. Gözlərinə söz ola bilməz.

Canavar güzgünü qapıb aldı. Özünə xeyli baxıb dedi:

– Hm, gözəl olmağına sözüm yoxdur, amma yırtıcıya oxşayır.

O, güzgünü ilana verdi. İlan baxıb dedi:

– Ay aman, məgər siz onun dişlərinin dibindəki zəhərə fikir vermirsiniz? Bu saat o hamını çala bilər.

Meymun güzgünü ilanın əlindən qapdı və diqqətlə baxmağa başladı. Xeyli baxandan sonra qışqırdı:

– Belə çirkin heyvanın şəklini hələ bir əlinizə də alırsınız? – deyib güzgünü dərəyə tulladı. Güzgü sındı, hekayə də qurtardı.

*Zahid Xəlil*

## TUTUQUŞU

Keçmişdə bir tacir var imiş. Bir gün o uzaq səfərə yola çıxanda, yaxın adamlarını və kiçik oğlunu yanına çağırıb dedi:

– Mən səfərə gedirəm. Kim nə istəyirsə desin, alıb gətirim.

Hərə bir şey tapşırdı. Tacirin oğlu isə qəfəsdəki tutuquşuya bir yoldaş gətirməyi atasından xahiş etdi.

Axırda tutuquşu dilləndi:

– Getdiyin ölkədə böyük bir ağac var. Onun budaqlarında çoxlu tutuquşu yaşayır. Əgər sən o ağacı tapsan, mənim salamımı tutuquşulara yetirərsən. Nə cavab versələr, gəlib mənə deyərsən.

Tacir hamı ilə görüşüb yola düşdü.

Tacir yad ölkədə işini qurtarıb tutuquşunun dediyi yeri axtarıb tapdı. Bura böyük çəmənlik idi. Al-əlvan güllərin iyi ətrafı bürümüşdü. Kəpənəklər uçuşur, arılar vızıldaşırdı. Çəmənliyin düz ortasında isə böyük bir ağac var idi. Tacir ağacdakı gözəl tutuquşuları görüb dedi:

– Ey tutuquşular, mənim tutuquşum sizə salam göndərib.

Tacir bu sözü deyən kimi ağacdakı tutuquşulardan biri yerə düşüb öldü.

– Yəqin mənim tutuquşumu çox sevirmiş, onun salamını eşitcək davam gətirmədi, – deyə tacir tutuquşunun ölümünə heyfsiləndi və oradan getdi.

Bir neçə vaxt keçdi. Tacir geri döndü. Aldığı şeyləri sahiblərinə payladı. Tutuquşuya isə bir söz demədi.

Oğlu atasından soruşdu:

– Bəs tutuquşuya bir cavab gətirməmisənmi?

– Oğlum, onun xahişini yerinə yetirmişəm, amma tutuquşular mənə bir cavab demədilər. Bir də, gördüyümü deyib onu qüssələndirmək istəmirəm.

– Ata, de, qüssələnməz.

Tacir danışmağa başladı:

– Mən həmin yeri tapıb, sənin salamını dostlarına yetirdim. Elə bu vaxt tutuquşulardan biri yerə düşüb öldü.

Tacir sözünü yenicə qurtarmışdı ki, tutuquşu qəfəsin içində yerə sərildi.

Sevimli tutuquşunun ölümü ata ilə oğulu kədərləndirdi. Tacir ölmüş tutuquşunu bayıra tulladı.

Elə bil ki, tutuquşu bunu gözləyirmiş. O, birdən pırıltı ilə uçub getdi. Oğlan bu işə təəccüb etdi və atasına dedi:

– Ata, bu nə olan işdi?

– Oğlum, indi mən hamısını başa düşdüm. Bizim tutuquşu ağacdan düşüb özünü ölülüyə vuran dostunun hiyləsi ilə azadlığa çıxdı.

*Hacı Ağayev*

## HİND NAĞILI

Bir dəfə hökmdar müdrik qocadan soruşdu:

– Döyüşdə hər şeydən çox nə lazımdır?

Qoca cavab verdi:

– Qibleyi-aləm, hər şeydən çox igidlik lazımdır!





Hökmdar qəzəbləndi:

– Bəs qüvvə, bəs silah?! Yoxsa sən bunları unudursan?!

– Hökmdar, bunları unutmuram, ancaq döyüşçünün ürəyində igidlik olmasa, ona nə silahı, nə də qüvvəsi kömək etməz, – deyə müdrik qoca cavab verdi.

## BİR DOVŞAN İKİ TÜLKÜNÜ NECƏ ALDATDI?

İki tülkü meşədə boş-bikar gəzirdi. Özlərinə peşə tapa bilmirdilər.

Onlar gəzib-gəzib dovşanın evinin yanına gəlib çıxdılar. Tülkünün biri dedi:

– Bəsdir, avara gəzdik. Gəl dovşanı çağıraq, çölə çıxanda, onu aldadıb yeyək.

O biri tülkü razı oldu. Onlar dovşanı səslədilər. Dovşan eşiyə çıxıb tülkülərin yanına gəldi. Tülkülərdən biri dedi:

– Bilirsən nə var, biz səni yemək istəyirik.

– Niyə?

O biri tülkü dedi:

– Doğrusu, ac deyilik. Ancaq bikarlıqdan səni yeyirik.

İkinci tülkü də öz dostunun sözünə qüvvət verdi:

– Bilirsən, bekarçılıq çox pis şey imiş. Neçə vaxtdır meşəni veyil-veyil gəzirik, özümüzə bir peşə tapa bilmirik.

Dovşan dedi:

– Sizə elə peşə tapım ki, ürəyinizdən olsun.

– Tap, tap! – tülkülərin ikisi də sevindi.

– Bax, sizin dədə-babanız, babanızın da ulu babası cütçü olub. Siz də gedin cütçülük edin.

Tülkülərdən biri dedi:

– Axı bizim toxumumuz yoxdur.

– Toxum məndə.

Dovşan evinə qaçıb ətəyini dənəvər duzla doldurub geri qayıtdı:

– Bax, əvvəl-əvvəl torpağı şumlayın. Sonra bu toxumu səpib üstündən mala çəkin. Üçcə gündən sonra görün nə qədər məhsul götürürsünüz!

Tülkülər duzu dovşandan alıb, sevincək yola düşdülər. Gəlib tarlaya çıxdılar. Burada böyük bir sahəni şumlayıb duzu torpağa səpdilər. Üç gün gözlədilər, duz göyərmədi. Beş gün gözlədilər, duz göyərmədi, bir ay gözlədilər, duz göyərmədi. Axırda qəzəblə dovşanın yanına gəldilər.

– Ay dovşan! Ay dovşan! – deyə dovşanı səslədilər.

Dovşan eşiyə çıxdı, tülküləri salamlayıb dedi:

– Məhsulu topladınızmı?

Tülkülərdən biri qəzəblə dedi:

– Sən verən toxumun biri də bitmədi.

– Bu ola bilməz. Sizin toxumunuzu kimsə oğurlayıb.

Tülkülər ikisi də bərk fikrə getdilər: "Bizim yerə səpdiyimiz toxumu kim cəsarət edib oğurlaya bilər?"

Elə bu vaxt iki çibin uçub dızıltıyla tülkülərin alnına qondu. Dovşan əlini dodağına apararaq:

– Susss! – elədi, – sakit olun, toxumunuzu oğurlayanı tapmışam.

Tülkülər ikisi də kirimişcə dayandılar. Dovşan qaçaraq iki ağac gətirdi. Tülkülərin hərəsinin əlinə bir ağac verib milçəkləri göstərdi:



– İkiniz də birdən vurun, – deyə işarə etdi.

Tülkülər var gücləri ilə bir-birinin başına dəyənəklə vurdular.

Çibinlər uçub getdi. Tülkülər isə huşlarını itirib yerə yıxıldılar.

*Əli Səmədli*

## ÇÖRƏK

Biri var idi, biri yox idi, Allahın bəndəsi çox idi. Lap qədim zamanlarda öz əlinin zəhməti ilə çörəyini qazanan Etibar adında bir kişi var idi. Bu kişinin gülərüz, mehriban arvadı, bir-birindən balaca on iki uşağı vardı. Etibar kişi hər gün səhər gün çıxmamışdan yerindən durub cütünü qoşar, yer şumlayar, taxıl əkər, sulayar, alnının tərini tökə-tökə qızmar yayda biçin biçər, xırman döyərdi. Bu ağır zəhmətnən başa gələn çörəyin də qədrini-qiymətini, hörmətini yaxşı bilərdi. Bir dəni çöldə qoymaz, bir tikə dənin ayaq altına düşməsinə razı olmazdı. Odur ki, din-bərəkət də ondan qaçmaz, nemət başından yağardı. Tək canıynan işləsə də, on dörd baş külfəti firavan saxlayardı. Şahın vergisini, xanın-bəyin tələbini ödəyirdi. Hələ bir seyid, molla, koxa, dərviş də onun xırmanından ruzi aparırdı. Arvadına tapşırmışdı deyin, özü evdə olmayanda arvadın, olanda da özünün işi-peşəsi uşaqların dalınca gəzib yerə düşən çörək tikələrini yığmaq idi.

Günlərin bir günündə bu ölkənin padşahı ovdan qayıdanda yolu Etibar kişinin evinin yanından düşdü. Gördü ki, səliqə-sahmanlı bir həyətdə bir dəstə uşaq oynayır. Hamısı da böyüklü-kiçikli bir-birinə oxşayır. Deyəsən, bacı-qardaşdılar. Hamısının da yanağından qan damır. Elə bil ölkədəki qıtlıqdan heç bunların xəbəri yoxdur. Şah darğanı çağırıb elə atüstü hal-əhval tutdu, soruşdu:

– Bu ev kimindir, bu külfət, bu colma-cocuq kimindir?

Darğa qorxa-qorxa cavab verdi:

– Qibleyi-aləm, bu cütçü Etibar kişinin həyətidir. On iki uşağı var. Ən böyüyü hələ çomaq götürmür.



Şahı heyrət götürdü:

– Yaxşı, bu qıtlıq zəmanədə o bu külfəti necə dolandırır? Yəqin vergi-zad almırsınız?

Darğa bir az cürətləndi:

– Qurbanın olum, qibleyi-aləm, necə ki, almırıq? Alırıq! Artıqlamasıynan verir, fitrəsin, zəkatın, imammalısın, seyidmalısın da ötürmür.

Şahın təəccübü daha da artdı:

– Yəqin başqa yerdən gəliri, ya da dədə-baba irsi-zadı var.

– Xeyr, qibleyi-aləm, bircə cütü var. Dəxi heç nəyə gümanı gəlmir.

Şah danışdıqca onun ağıllı vəziri həyətə, burada oynaşan uşaqlara göz qoyurdu. Nə fikrə gəldisə, birdən sözə qarışdı:

– Qibleyi-aləm, darğa haqlıdır. Bunun bircə sirri var. Mən deyəsən o sirri tapmışam.

Şah maraqla soruşdu:

– Nədir?

Vəzir gözünü həyətdən çəkmədən cavab verdi:

– Bu evdə çörəyə hörmət var, hökmdarım! Bir bax, o qədər uşaq olan həyətdə ayaq altında bircə qırıq çörək də yoxdur.



Elə bu vaxt Etibar kişinin arvadı təndirxanadan çıxdı. Başındakı tabaqda qıpqırmızı qızarmış lalagülü çörəklər buğlanır, sarı buğda çörəyinin ətri burnuna dəyənləri bihuş eləyirdi. Uşaqlardan kiçikləri anasının qıçlarına sarmaşdılar:

– Ana, qoğal! Ana, kökə!

Arvad heç körpələrinə tərəf əyilmədi də. Başındakı tabağı yerişinə həmahəng yelləyə-yelləyə evə doğru irəlilədi və uşaqlara belə cavab verdi:

– Gedin, əlinizi tərtəmiz yuyun, mən də evdə süfrə salım, gəlin oturun, çörəyinizi orada yeyin.

Bunu eşidən vəzir dedi:

– Görürsünüzmü, qibleyi-aləm, bu evdə çörəyin qədir-qiyməti böyükdür.

Şah dedi:

– Yaxşı bax, ola bilməz ki, çörəkdən bir qırıq ayaq altına düşməsin, axı onlar uşaqdır.

– Yox, hökmdarım, görünür ki, ana onlara təndir çörəyini qədərincə verir. Təndir çörəyi ovulmur. Uşaqlar da elə tərbiyə alıblar ki, artıq dişdəmi, loğmanı yerə atmırlar.

Padşah saraya qayıtdı. Nə düşündüsə, səhər belə bir əmr verdi:

– Ölkədə heç kəs təndir çörəyi bişirməsin. Hamı yalnız yuxa, nazik lavaş, sac çörəyi bişirsin, yesin.

Bir müddət sonra padşah vəzirinə dedi:

– Vəzir, bilmirsən, o cütcü necədir?

– Soruşdum, qibleyi-aləm, darğa deyir ki, bu il də buğdası yaxşı gəlib, bərəkət başından yağır.

Şah atlandı:

– Gedək, vəzir, öz gözümlə görməsəm inanmaram. Axı sənin sözünə qalsa yuxa, lavaş yeyəndə kövrək qırıntılar uşaqların əlindən ovxalanıb aləmə dağılmalıdı. Ayaq altı çörəklə dolu olmalı, nemət də o yurddan qaçmalıdır. Yoxsa, fərmanıma əməl etməyib təndir çörəyi bişirtdirir? Də-

risinə saman təpdirrəm!

Onlar söhbətləşə-söhbətləşə Etibar kişinin həyətinə çatdılar. Gördülər ki, həyətdə oynaşan uşaqların hər birinin boynuna təmiz, ağ parçadan tikilmiş bir torba asılıb. Uşaq lavaş, yuxa yemək istəyəndə ağzını torbaya tutub yeyir və qırıntılar da ora tökülür. Bunu görən vəzir dilləndi:

– Gördünmü, hökmdarım, bu yurddan çörək əskik olmaz. Burada onun qədrini də bilirlər, hörmətini də. Ayaq altına düşməyə qoymurlar.

*Əzizə Cəfərzadə*

## QARI VƏ PİŞİK

Bir gün bir qarı inəyini apardı suvarmağa. İnəyin ayağı buzun üstündə sürüşüb yıxıldı və qıçı sındı. Onda qarı buza dedi:
– A buz, sən nə güclüsən!
Buz cavabında dedi:
– Əgər mən güclü olsaydım, gün məni əritməzdi.
Qarı dedi:
– A gün, sən nə güclüsən!
Gün cavabında dedi:
– Əgər mən güclü olsaydım, bulud qabağımı kəsməzdi.
Qarı dedi:
– A bulud, sən nə güclüsən!
Bulud dedi:
– Mən güclü olsaydım, yağış məndən yağmazdı!
Qarı dedi:
– A yağış, sən nə güclüsən!
Yağış dedi:
– Əgər mən güclü olsaydım, ot məndən bitməzdi.
Qarı dedi:
– A ot, sən nə güclüsən!
Ot dedi:



– Mən güclü olsaydım, qoyun məni yeməzdi!
Qarı dedi:
– A qoyun, sən nə güclüsən!
Qoyun dedi:
– Əgər mən güclü olsaydım, qurd məni yeməzdi!
Qarı dedi:
– A qurd, sən nə güclüsən!
Qurd dedi:
– Mən güclü olsaydım, it məni boğmazdı.
Qarı dedi:
– A it, sən nə güclüsən!
İt dedi:
– Mən güclü olsaydım, çoban məni döyməzdi.
Qarı dedi:
– A çoban, sən nə güclüsən!
Çoban dedi:
– Mən güclü olsaydım, xanım məni söyməzdi.
Qarı dedi:
– A xanım, sən nə güclüsən!
Xanım dedi:
– Əgər mən güclü olsaydım, siçan torbalarımı kəsməzdi.
Qarı dedi:
– A siçan, sən nə güclüsən!
Siçan dedi:
– Əgər mən güclü olsaydım, pişik məni yeməzdi!
Qarı dedi:
– A pişik, sən nə güclüsən!

Pişik iki əllərini qabağa, iki ayaqlarını dala qoyub, gərdənini çəkib, quyruğunu qalxızıb gözlərini bərəldib, dilini çıxarıb, qarıya dedi:

Güclüyəm ha, güclüyəm,
Dəmir daraq dişliyəm.
Yük üstü yaylağımdır,
Yük altı qışlağımdır.
Kürsü üstə duraram,
Bığlarımı buraram...

## YUMURTA ƏHVALATI

Deyirlər, keçmişdə bizim el-camaat çox pak nəfsli xalq imiş. Birinin bir qarış torpağında, bir yoluq cücəsində, bir axsaq keçisində gözü yox imiş.

Elin ağsaqqalı, ağbirçəyi camaatı hər şeydən əvvəl nəfsdən qoruyurmuşlar. Deyirmişlər: "İnsan öz nəfsinə "dayan" deməyi bacarmalıdır, "dayan" deyə bilmirsə, insanlıqdan çıxır." Uşaqları da körpəlikdən bu tiynətdə böyüdürmüşlər.

Odu ki, bizim elimizə-camaatımıza heç kəsin gücü çatmırmış, bir yağının dişi batmırmış, bir padşahın qəzəbi keçmirmiş. Axı niyə də keçsin? Şahdan nə fərman çıxırmışsa, ədalət yoluynan, öz vaxtında yerinə yetirirmişlər. Amma o çağlarda bir ədalətsiz, zalım padşah var idi. Qaşınmayan yerdən qan çıxarmaqdan xoşu gələrmiş. İl keçir, ay dolanır, padşah baxıb görür ki, heç bu eldən bircə adam boğazlaya bilməyib, bir göz çıxartdırmayıb, bir əl kəsdirməyib... Belə də şey olar? Bir şeytana papış tikən vəziri var imiş. Padşah bir dəfə söhbət vaxtı ondan soruşur:

– Vəzir, yəni bu camaatın heç cəzaya layiq olanı yoxdur?

Vəzir eli yaxşı tanıyırmış. Padşahın cavabını əlüstü verir:

– Qibleyi-aləm, yoxdur!

– Ola bilməz, vəzir! Yaxşı baxmamısan.

– Baxmışam, qibleyi-aləm, lap yaxşı baxmışam. Onları lap xəlbirdən keçirmişəm, düyü kimi arıtlamışam, vallah, un kimi ələmişəm. Günahkar yoxdur ki, yoxdur.

– Yəni heç elə xalq olar?

– Olarmış, qibleyi-aləm! Mən də inanmırdım, amma olarmış. Bütün ətraf qəbilələr, xalqlar bunlara pak nəfslilər deyirlər. Çünki bunlar bir kəsin bir tikə haramını indiyəcən nəinki yeməyiblər, hətta haram tikəyə əl də uzatmayıblar. Odur ki, nəfsləri pakdır, alqışları-qarğışları tez yerini alır. Deyirlər, haram yeməyiblər, ondandır.

– Vəzir, sabah hər evdən birini tut, at zindana.

Vəzir padşahın fərmanın can-başla qəbul edir. Səhərə





də qoymur: "Kişi olan kəs – bu günün işini sabaha qoymaz,"– deyir. Hər evdən sanılı qoz kimi bir nəfər tutub salır zindana.

Evlərə müsibət ayaq açır. Ana oğlunu, uşaq atasını, arvad ərini deyib ağlayır. Camaat yığılıb ağsaqqalları dövrələyir: "Gedin, padşahdan bizim gedənimizin getmək səbəbini soruşun," – deyirlər. Ağsaqqallardan biri ağır-ağır dillənir:

– Övladlarım, mən bu gecə sübhü diri gözlə açmışam. Fikirləşmişəm, görüm padşah niyə bizim adamları tutub? Axı onların günahı nədi? Görmüşəm ki, padşah qəzəbinə nahaq zor verib. Bizim heç bir taxsırımız yoxdur. Mən hamının adından onu haqqa-ədalətə tapşırmışam. Qoy Allah onunla ədalət divanı eləsin. Siz ki, düzsünüz, əyri yanına gedib əyilməyin. Haqq yerini tutacaq. Haqqa yalvarın!

Camaatın nifrinindən, qarğışından o gecə padşahın çox istəkli oğlu – vəliəhdi azarlayır, düşür, yıxılıb ölür.

Vəzir padşaha deyir:

– Qibleyi-aləm, bu onların nəfsindəndir. Onların qarğışı da, alqışı da tez yerini alır. Özünü bundan da betərindən qoru!

Padşah qorxuya düşür:

– Tez onların adamların burax getsin!

Tutulanlar buraxılır. Padşah deyir:

– Vəzir, bir tədbir tök!

Vəzir deyir:

– Padşah, gərək bu elin tikəsi dəyişsin, tikəsinə haram qatılsın.

– Qat da! Nə durmusan?

– Qoy bir fikirləşim, qibleyi-aləm!

– Sənə üç gün möhlət verirəm, vəzir! Üç günəcən çarə tapmasan, başın bədənindən ayrılacaq. Özündən küs. Sonra demə ki, bilmədim.

Vəzir padşahın xasiyyətinə bələd idi. Bilirdi ki, dediyini eləyəndi. İllah da ki, belə şey ola.

Qərəz, vəzir gecə-gündüz fikirləşib çarə axtardı ki, görsün bu elin halal tikəsinə haramı necə qatsın? Hansı yolla qatsın ki, alqış-qarğışları, pak nəfsləri kəsərdən düşsün. Amma özləri də bilməsinlər. Axı bilsəydilər razı olmazdılar, qoymazdılar.

Nə başınızı ağrıdım. Üçüncü gündə vəzir padşahın adından bütün elə, elata, qonşu diyarlara fərman yazdı ki, bəs bu ilin töycüsü, bütün vergi rüsumu əhaliyə bağışlanılır. Amma bir şərtlə: hər evdən bircə dənə yumurta gətirilsin, padşahın anbarına təhvil verilsin.

Bəli, səhər oldu, gün üzünüzə xeyirliyə açılsın. Carçılar küçələrə çıxdılar. Padşahın fərmanını küçələrdə, bazarlarda, çarşılarda, meydanlarda, karvansaralarda oxudular. Hamı verginin götürülməyinə sevindi. Bir yumurta adını eşidəndə güldü. Çoxları dedi: "Şükür Allaha, padşahımız ədalətə gəlib, rəhm eləyib təbəəsinə. Yumurtanı da ya zarafatnan camaatı güldürməkçün istəyib, ya da ki, məsciddən, karvansaradan tikdirəcək, onunçün istəyib."

Dünyagörmüş ağsaqqallar, ağbirçəklər dedilər:

– Allah axırını xeyrə calasın. Yumurtanı aparın. Amma padşahdan ədalət hələ ki, görməmişik.

Hər evdən bir yumurta götürüb gəldilər padşahın anbarının qapısına. Qapıda anbardar dayanmışdı. Yumurta gətirənlərə deyirdi:

– Aparın, öz əlinizlə anbarda istədiyiniz yerə qoyun.

Qərəz ki, yumurta yığılıb qurtardı. O biri gün şahdan yenə fərman çıxdı: "Daha yumurta lazım olmadı, gəlin yumurtalarınızı aparın." Bəli, istəyəni də, istəməyəni də qabaqlarına qatıb anbara gətirdilər, içəri qatdılar, əmr etdilər:

– Hərə öz yumurtasını götürsün.

Yumurta yumurtadı da, hamısı da bir-birinə oxşayır. Anbarda dəyişik düşmüşdü. Heç kəs öz gətirdiyini tapa bilməzdi. Hərənin əlinə keçən bir yumurtanı aparmağa məcbur elədilər. Tikələr dəyişdi. O boyda eldə-elatda, o qədər qonum-qonşu tayfada, camaatda bir oğru, bir əliəyri, bir haramxor olmamış olmazdı. Halal harama qarışdı. Pak ağızlara napak, haram tikə dəydi. Nəfslər kəsərdən düşdü, elin alqışı, qarğışı heç nəyə əsər eləmədi. Zalım padşahın əli-qolu açıldı. Atını sağa da çapdı, sola da. El lənətindən qorxub hürkmədi. Bildiyi zülmü xalqa elədi.

*Əzizə Cəfərzadə*

### TÜLKÜ VƏ CANAVAR

Günlərin bir günü tülkü bərk acmışdı. Çox gəzdi, dolandı, gəlib bir bağın yanına çıxdı. Baxdı ki, tələdə bir parça quyruq var. Kənarda oturmuşdu, quyruğa baxırdı,

ağzının suyu axırdı. Bu zaman bir canavar gəlib çıxdı. Tülküdən soruşdu:

– Tülkü baba, niyə quyruğu yemirsən?

Tülkü dedi:

– Orucam.

Canavar dedi:

– Mən oruc-zad deyiləm, yeyəcəyəm.

Tülkü dedi:

– Ye.

Canavar quyruğu yemək istəyəndə, tələyə ilişdi. Quyruq sıçrayıb kənara düşdü. Tülkü quyruğu götürüb yeməyə başladı. Qurd ondan soruşdu:

– Bəs orucdun?

Tülkü dedi:

– Ayı gördüm, onunçün yeyirəm.

Canavar dedi:

– Bəs mən nə vaxt ayı görəcəyəm?

Tülkü dedi:

– Tələnin sahibi gələndə.

Tülkü quyruğu təzəcə yeyib qurtarmışdı ki, tələ sahibi gəlib çıxdı. Tülkü:

– Canavar lələ, ay göründü, – deyib götürüldü.

Tələ sahibi canavarı görəndə dedi:

– Aha, mən səni çoxdan axtarırdım, yaxşı əlimə düşmüsən!

Canavar yalvarmağa başladı:

– Axı mənim günahım nədi? Yazığam, burax gedim.

Tələ sahibi dedi:

– Sənin günahın çoxdu, yazıq heyvanları parçalayıb yeyirsən.

Kişi sözünü qurtardı, dəyənəklə canavarı döyüb öldürdü, dərisini soyub evinə apardı.





# BUNLARI BİLMƏK MARAQLIDIR



### NƏ ÜÇÜN SU İLƏ YUYUNURLAR?

Nə üçün çirki su təmizləyir? Bəlkə su çaya düşən yonqarı axıdıb apardığı kimi çirki də eləcə yuyub aparır?

Gəlin, özümüz yoxlayaq. Çirkli əllərinizi suyun altına tutub saxlayın. Məgər bununla əlləriniz təmiz olacaqmı?

Təəssüf ki, yox. Axı heç kəs belə yuyunmur. Biz yuyunanda mütləq əllərimizi bir-birinə sürtürük. Maraqlıdır, nə üçün? Əlbəttə ki, yumaq, çirki sürtüb çıxarmaq üçün.

Paltarı da belə yuyurlar. Paltar yuyanda onu suya qoymaqla kifayətlənmirlər, sürtür, hətta şotkalayırlar.

Paltar yumaq – onun üstündəki çirki sürtüb çıxarmaq deməkdir. Eynilə kağızda yazılanı rezinlə pozduğumuz kimi. Çirk təmizləndikdən sonra isə su onu asanlıqla yuyub aparır.

*M. İlin*

### NƏ ÜÇÜN DÖŞƏMƏNİN ÜSTÜNDƏ KONKİ İLƏ SÜRÜŞMƏK OLMUR?

Bir oğlandan nə üçün döşəmənin üstündə konki ilə sürüşməyin mümkün olmadığını soruşduqda belə cavab verdi:

– Çünki buz sürüşkən və çox bərkdir, döşəmə isə belə



sürüşkən və bərk deyil.

Ancaq elə daş döşəmələr də olur: onlar sürüşkən və bərkdir, lakin daş döşəmənin də üstündə sürüşmək mümkün deyil.

Biz buzda sürüşəndə buz konkinin ağırlığından əriyir. Konki ilə buz arasında su təbəqəsi əmələ gəlir. Əgər bu su təbəqəsi olmasa idi, buz üstündə də sürüşmək döşəmə üstündə sürüşmək kimi çətin olardı. Su maşın yağı kimi konki ilə buz arasında sürtünməni azaldır. Dağlarda buzların sürüşməsi də eyni səbəbdən baş verir. Buzun ağırlığından onun alt hissəsi əriyir, buz qatları sizin konkilərinizin meydançada sürüşdüyü kimi dağ yamaclarından sürüşməyə başlayır.



### KİBRİT NƏ ÜÇÜN YANIR?

İbtidai insanlarda indiki kimi mükəmməl əmək alətləri yox idi. Onların nə mişarı, nə də baltası vardı.

İbtidai insan ağacı iti daş və ya sümüklə kəsib yonurdu. Bu cür alətlərlə işləmək heç də asan deyildi. O qədər çox sürtüb itiləmək lazım gəlirdi ki, bəzən ağac od tutub yanırdı. Yəqin ki, elə bunun nəticəsində insan sürtünmənin köməyi ilə od əldə etməyin mümkün olduğunu başa düşmüşdü.

Ağacın alışması üçün onu gərək lap çox qızdırasan. Deməli, bunun üçün ağacı uzun müddət bir-birinə sürtmək lazımdır.

Kibritə gəldikdə isə məsələ başqa cürdür. Kibritin başı cüzi istilikdən alışan materialdan hazırlanıb. Kibriti yandırmaq üçün onun başını qızmış dəmirə, məsələn, yanan sobanın qapağına toxundurmaq kifayətdir. Əgər kibritin o biri başını qızmış dəmirə sürtsəniz, o yanmayacaq.

Elə buna görə kibriti alışdırmaq üçün onu uzun müddət qutunun yanına sürtmək lazım gəlmir. Azca toxunduran kimi asanlıqla yanır.

### NƏ ÜÇÜN SU ALOVU SÖNDÜRÜR?

Əgər yanan şamı suya atsaq, o sönər.

Görəsən, nə üçün?

Ona görə ki, şamın yanması üçün su yox, hava lazımdır. Su alovu söndürür, çünki o yanan cisimlə havanın təmasına mane olur.

Alovu başqa üsulla da söndürmək olar. Bunun üçün yanan yeri qalın adyalla örtmək və ya ora qum tökmək lazımdır. Adyal və ya qum havanı oda yaxınlaşmağa qoymur və od sönür.

### KARTOF NƏDİR?

Kartof nədir? Bunu ki, hamı bilir.

Yox, kartofun nə olduğunu heç də hamı bilmir. Məsələn, siz kartofun nədən ibarət olduğunu bilirsinizmi? Əgər bilmirsinizsə, belə bir təcrübə aparın. Çiy kartofu sürtkəcdən keçirin, əmələ gəlmiş sıyığı su ilə qarışdırdıqdan sonra süzün.

Bir azdan sonra qabın dibində ağ çöküntü əmələ gələcək. Suyu süzün, çöküntünü suçəkən kağızın üstünə töküb qurudun. Kağızın üstündə ağ toz əmələ gələcək.

Bu nədir?

Bu nişasta və yaxud kartof unudur. Kartofun tərkibində nişasta çoxdur, ancaq nə üçün biz onu çox vaxt görmürük? Ona görə ki, nişasta dənələri kartofun içində anbarda olduğu kimi balaca qutucuqlarda – hüceyrələrdə gizlənib.





### NƏ ÜÇÜN KARTOFU ÇİY YEMİRLƏR?

Nişastanı əldə etmək o qədər də asan deyil. Bunun üçün biz kartofu sürtkəcdən keçirməli olduq. Mədədə isə belə sürtkəc yoxdur və kartofu əzmək mədə üçün çox çətindir.

Bax, buna görə də kartofu çiy yemirlər. Kartofu qaynadanda hüceyrələrin divarı istidən dağılır və su nişasta dənələrini isladır. Bunun nəticəsində nişasta dənələri şişir və yumşalır. Buğda bişmiş kartof ona görə quru olur ki, bütün suyu nişasta dənələri canına çəkir. Elə buna görə də sudan çıxaran kimi kartof quruyur.

### NƏ ÜÇÜN QIZARDILMIŞ KARTOFUN ÜSTÜ BƏRK, QAYNADILMIŞ KARTOFUNKU İSƏ YUMŞAQ OLUR?

Kartofu qızardarkən qaynadanda olduğundan çox qızdırmaq lazımdır. İstinin təsirindən kartofun üstündəki nişasta dekstrinə – nişasta dənələrini bir-birinə birləşdirən qırmızı qabığa, yəni, yapışqana çevrilir.

Yəqin ki, siz dəfələrlə dekstrindən hazırlanmış yapışqandan istifadə etmisiniz. Ancaq bunun nədən alındığı heç ağlınıza da gəlməyib...

## NƏ ÜÇÜN ÇÖRƏK QURUYUR?

Un kisəsini bütün nişastası axana qədər suyun altında yuyun. Kisədə yapışqanlı, ağır maddə qalacaq. Bu yapışqan maddəsidir. Yapışqan maddəsinin əsas fərqləndirici əlaməti bir-iki saat qalandan sonra onun şüşə kimi bərk və asan ovulan kütləyə çevrilməsidir.

Çörəyin qurumasının səbəbi də budur. Unun tərkibindəki yapışqan maddəsi kövrək və quru məhlula çevrilir.

## NƏ ÜÇÜN NİŞASTALANMIŞ PALTAR BƏRK OLUR?

Nişastalanmış paltarı isti ütü ilə ütülədikdə nişasta istinin təsirindən dekstrinə çevrilir. Bu vaxt paltarın səthində kartofda olduğu kimi bərk qabıq əmələ gəlir.

Buna görə də paltarın yaxalığı elə bərk olur ki, bəzən adamın boynunu sürtür.

## NƏ ÜÇÜN ÇÖRƏYIN QABIĞI OLUR?

Təkcə kartof ununda deyil, adi unda da nişasta var. Buna görə də çörəyi bişirəndə onun üstündə qabıq əmələ gəlir.

Bəs unun da tərkibində nişastanın olduğu doğrudurmu? Bəlkə mən sizi aldadıram, orada heç bir nişasta-zad yoxdur? Yaxşı olar ki, siz mənim dediklərimin doğruluğunu özünüz yoxlayasınız.

Bir tikə xəmiri əskiyə bükün və onu su ilə dolu qaba sıxa-sıxa yuyun.

Su bir azdan süd kimi ağappaq olacaq. O çökəndən sonra siz qabın dibində kartofda olduğu kimi ağ çöküntünün əmələ gəldiyini görəcəksiniz. Deməli, mən doğru deyirdim, unun tərkibində nişasta vardır.





## ŞORBA NƏDİR?

Bəziləri bulyonu çox qidalı yemək hesab edir. Əslində isə bulyonun tərkibində qidalı maddələr suda olduğundan bir qədər artıqdır. Bir boşqab bulyonun tərkibində 12 qaşıq su və yalnız bir qaşıq digər maddələr vardır. Əgər bulyonu bütün suyu çəkilənə qədər qaynatsaq, qabın dibində demək olar ki, heç nə qalmayacaq. Bir boşqab şorbanı laboratoriyaya aparıb analiz etsək məlum olar ki, bir boşqab şorbanın tərkibində 12 qaşıq sudan əlavə 1/4 qaşıq yağ, 1/4 qaşıq yapışqan zülalı, bir az duz (təkcə adi duz deyil, həmçinin başqa duzlar da) vardır, yerdə qalanlar isə dad maddələridir. Dad maddələri ətə dad verən və qaynayarkən suda həll olan əsas hissədir. Ancaq əslində təkcə şorbada deyil, yediyimiz hər şeyin tərkibində ilk baxışda göründüyündən daha çox su var. Tərəvəzlərin tərkibində su o qədər çoxdur ki, onları qurutduqda tük kimi yüngül olurlar. Bir kiloqram ətdə təxminən 700 qram su vardır. Kartofda da həmçinin.

Papanin Şimal qütbünə səfər etməyə hazırlaşanda İctimai İaşə Mühəndisləri İnstitutuna gedib xahiş etmişdi ki, elə bir yemək hazırlasınlar ki, ona və yoldaşlarına il yarım bəs eləsin və çəkisi də çox ağır olmasın.

Həmin yeməyi belə hazırlamışdılar: bir neçə ton əti, tərəvəz və meyvəni böyük qazanlarda qaynadaraq onların tərkibindəki suyu buxarlandırmışdılar. Suyu buxarlanmış bu ərzaq məhsulları tamamilə yüngülləşib və bir neçə dəmir bankaya yerləşdirilmişdi.

## BİZ ƏTİ NƏ ÜÇÜN YEYİRİK?

Biz şorbadan danışdıq, indi də keçək ətə. Əgər biz ətin analizini aparsaq görərik ki, şorbada olduğu kimi onun tərkibində də su, dad maddələri və duzlar var. Bununla yanaşı, onun tərkibinin əsas hissəsini şorbada az miqdarda olan zülallar təşkil edir.

Əti qaynadarkən zülal parçalanır və kəf şəklində suyun üzərinə yığılır. Əksər qadınlar şorba dadlı olsun deyə, kəfi yığırlar və bunu çox nahaq edirlər: çünki ət zülalı – çox dadlı maddədir.

Zülalsız həyat yoxdur, çünki bizim əzələlərimiz qoyun və dana əti kimi sudan və zülaldan ibarətdir.

Biz yalnız tərkibində çoxlu yağ, şəkər, nişasta olan ərzaq məhsulları ilə qidalansaq və zülal qəbul etməsək, gec-tez orqanizmimiz lazımi qidaların qıtlığı ucbatından zəifləyib məhv olacaq.

Lakin təkcə zülalla da yaşamaq olmaz. Əgər biz yalnız ətlə qidalansaq, onda ən azı gündə 2-3 kiloqram ət yeməklazım olardı ki, ən sağlam mədə belə bunu həzm etmək iqtidarında deyil.

Deməli, bizə həm yağlar, həm karbohidratlar, həm də zülallar lazımdır. Onlar həm "yanacaq" rolunu oynayaraq orqanizmimizi qızdırır və bütün "maşını" işə salır, həm də bədənimizin qurulması üçün tikinti materialı funksiyasını yerinə yetirir.



## SÜD NƏ ÜÇÜN TURŞUYUR?

Süd bir-iki gün qaldıqdan sonra turşuyur. Lakin onu iki günə deyil, iki dəqiqəyə də turşutmaq və kəsmiyə çevirmək olar.

Bunun üçün südə az miqdarda sirkə qatmaq kifayət edər ki, kəsmik dərhal ayrılsın.

Kəsmik – süd zülalıdır. Şəkər suda həll olan kimi, kəsmik də süddə həll olur. Lakin südə sirkə qatan kimi kəsmik yağı da özü ilə çəkərək süddən ayrılır.

Lakin südə heç kəs sirkə qatmır. Bəs onda süd nə üçün turşuyur?

Bunun səbəbi havada olan kif göbələkləridir. Onlar südə düşən kimi dərhal öz işlərinə başlayırlar – süd şəkərini süd turşusuna çevirirlər. Bunun nəticəsində də süd turşuyur.

Süd turşumasın deyə, onu qaynatmaq lazımdır. Qaynama zamanı göbələklər məhv olur.

Hərdən elə olur ki, süd qaynadıqda belə ondan kəsmik ayrılır. Bu ona görə belədir ki, göbələklər artıq öz işlərini görə biliblər, yəni turşu hazırlamağa macal tapıblar.



## PENDİRDƏ NƏ ÜÇÜN DEŞİKLƏR OLUR?

Əgər kəsmiyi uzun müddət zirzəmidə saxlasaq, göbələklərin fəaliyyəti davam edəcək və gec-tez kəsmik pendirə çevriləcək.

Çörəkdə olduğu kimi pendirdəki deşiklər karbon qazının nəticəsində meydana gəlir.

Bəs karbon qazı haradan əmələ gəlir?

Onu göbələklər yaradır.

## PENDİR NƏ ÜÇÜN UZUN MÜDDƏT XARAB OLMUR?

Çünki pendirin üstü qabıqla örtülür, bu qabıq pendiri qurumağa qoymur və zərərli göbələklərdən qoruyur.

Deyilənə görə, İsveçrədə belə adət var: uşaq anadan olanda pendir hazırlayırlar və onun üstünə uşağın adını, anadan olduğu günü və ili yazırlar. Bayram günlərində bu pendir süfrəyə qoyulur. Pendir insanı ömrünün sonunadək müşayiət edir...

İsveçrə mətbuatında 120 yaşı olan pendir barədə yazı dərc edilmişdi... Həmin pendir çox dadlı imiş.

## ƏN MÖHKƏM VƏ ƏN DAVAMSIZ MATERİAL NƏDİR?

Biz hamımız elə bilirik ki, dəmir ən möhkəm materialdır. Təsadüfi deyil ki, böyük körpülər, vağzallar bütünlüklə dəmirdən hazırlanır. Lakin bu ən bərk, həm də ən kövrək materialdır. Yüz tonlarla vaqonların ağırlığına davam gətirən dəmir körpülər nəmişlikdən, yağışdan, dumandan "qorxur". Havada nəmlik nə qədər çox olarsa, dəmir bir o qədər tez paslanar. Paslanma – ən möhkəm dəmir tikililəri belə hiss olunmadan məhv edən xəstəlikdir.

Bax, buna görə də qədim keçmişdən bu günümüzə gəlib çatan dəmir əşyalar çox azdır. Hər hansı bir Misir fironuna məxsus qızıl bilərzik və ya üzük tapmaq onun saysız-hesabsız təbəələrinə məxsus dəmir oraq tapmaqdan çox-çox asandır.

Ola bilər ki, yüz ildən sonra alimlər hazırkı bir çox dəmir tikililəri tapa bilməyəcəklər: onlar hamısı paslanıb məhv olacaq.



## BİZ ALT PALTARINI NƏ ÜÇÜN GEYİRİK?

Əgər biz paltarı çılpaq bədənə geyinsək üşüyərik, çünki bədənimizin ətrafında çox az hava qatı qalar. Lakin biz alt paltarını təkcə istilik üçün geyinmirik.

Məsələ burasındadır ki, alt paltarını həmişə yumaq olur, üst paltarını isə tez-tez yumaq mümkün deyil.

Məsələn, yun qaynamağa davamlı deyil. Əgər yunu qaynatsaq, o keçə kimi tiftiklənər. Çünki yun liflərinin üstü pambıq lifləri kimi hamar deyil, pulcuqludur. Qaynayan zaman liflər bir-birinə elə dolaşır ki, sonra onu açmaq mümkün olmur.

Buna görə də yun parçanı isti sobanın yanında qurutmaq və ya isti ütü ilə ütüləmək olmaz.

Yun parçanı yalnız yaş əski vasitəsilə ütüləmək mümkündür.

Pambıq və ya kətan liflərindən hazırlanmış alt paltarı isə istidən qorxmur. Buna görə də biz mahud və yaxud toxunma paltarın altından yuyulması və ütülənməsi asan olan alt paltarı da geyinirik.

*M.İlin*



## AĞ DOVŞAN

Dovşanın düşməni çoxdur: tülkülər, canavarlar, itlər, ovçular... Ancaq bütün bunlara baxmayaraq, yenə də onların sayı azalmır ki, azalmır. Ona görə ki, dovşanın dərisi yayda boz-qonur, qışda isə ağ rəngdə olur.

Elə ki, meşəyə ilk qar yağdı, dovşan tüklərini tökür və

onun qonur dərisi qar kimi ağ rəngə boyanır.

Bu vaxt tülkü ağ qarın üstündə dovşanı seçə bilmir. O, dovşan izlərini ayırd edənə qədər dovşan qaçıb qonşu meşədə olan cavan ağcaqayınları gəmirir.

Ancaq ağ dovşanın da öz dərdi var. Bir də görürsən ki, qar yağdı, qış gəldi və birdən... qar əriməyə başladı. Çöllərin bütün qarı əriyir və qara torpağın üstündə ağ dovşan lap uzaqdan asanlıqla seçilir. Bu vaxt dovşanın meşənin dərinliklərində gizlənib əsl qarlı-çovğunlu qışı gözləməkdən başqa çıxış yolu qalmır.

*Gennadi Snigiryov*



## USSURİYA PƏLƏNGİ

Bir zamanlar, yəni çox-çox əvvəllər Uzaq Şərq də cəngəlliklərdə olduğu kimi isti iqlimə malik yer idi. Soyuqlaşma başlayanda bütün heyvanlar köçüb cənuba getdilər, ancaq pələng qaldı.

Ağ qarın üstündə Ussuriya pələngi alova bənzəyir, buna görə də o ancaq gecələr qaranlıq düşəndən sonra ova çıxır. Yayda isə pələngi görmək mümkün deyil. O, suyun kənarında gizlənib maralın nə vaxt su içməyə gələcəyini gözləyir və dərhal üstünə atılır. Qamışlıq pələngi yaxşı qoruyur, axı onun dərisi zolaqlıdır. Nə qədər baxsan da qamışların arasından pələngin zolaqlarını ayırd edə bilməzsən.

Pələng yaxşı bilir ki, yayda onu görmək tamamilə qeyri-mümkündür. O, bundan istifadə edərək hətta kəndə gəlib itləri də oğurlayır. Əgər ovçular onun izi ilə qamışlığa gedərlərsə, pələng xəlvətcə onların gözündən oğurlanıb gizlənir və özü pişik kimi ovçulara göz qoymağa başlayır.

*Gennadi Snigiryov*

## KAMBALA

Dənizdəki balıqlar da maskalanırlar. Elə götürək kambalanı, yəni qalxan balığını. Kambala yastı, qoğal kimi yumru balıqdır, gözləri isə düşmənlərini – yırtıcı balıqları yaxşı seçsin deyə başının yuxarısında yerləşir.

Ancaq onu görmək o qədər də asan deyil. Yırtıcı balıqlar kambalanın düz yanından üzüb keçir, onu görmürlər. Çünki kambala dənizin dibindəki qum kimi sapsarıdır.

Kambala özünə yemi daşların arasında axtarır. Bu vaxt o daş kimi boz rəngdə olur.

Bir dəfə kambala üzərində belə bir təcrübə apardılar. Akvariumun dibinə şahmat taxtası qoydular. Kambala bir az "götür-qoy edəndən sonra" şahmat taxtası kimi damadama rəngə boyandı.

Buna görə də mağazalarda satılan kambala müxtəlif rəngdə olur. Əgər sarıdırsa, deməli, onu qumluqda tutublar. Əgər qəhvəyidirsə, deməli, suyun dibində daşlar var imiş. Bax, beləcə kambala əsl kəşfiyyatçı kimi rəngdənrəngə düşür.



## YALNIZ YAXINDAN GÖRƏNLƏR KİMLƏRDİR?

Əgər tərpənmədən otların arasında uzanıb böyüdücü şüşə, yəni lupa ilə ətrafı seyr etsək, o qədər maraqlı şeylər müşahidə edərik ki... Otlar nəhəng ağaclara bənzəyir, qarışqa isə parıltılı zireh geymiş qorxunc ifriti xatırladır. Böyüdücü şüşə ilə uzağa baxdıqda isə toranlıqdan başqa heç nə görmək mümkün deyil.

Bir dəfə lupa ilə baxdıqda gördüm ki, daşın dalında iri, tüklü bir hörümçək oturub. O oturub, nə az-nə çox, düz səkkiz gözü ilə yan-yörəsinə baxırdı. Gözlərdən nisbətən kiçik olan altısı ətrafı seyr edir, iri faranı xatırladan iki böyük gözü isə düz mənə baxırdı. Elə bil bu saat üstümə atılacaqdı!

Mən lupanı kənara qoyub baxdım – ah, sən demə, bu noxud dənəsindən də balaca, xırdaca bir hörümçək imiş. O heç mən tərəfə baxmırdı da, bütün diqqəti yanına qonmuş milçəkdə idi. Baxdı, baxdı və birdən elə hoppandı ki, milçək heç tərpənməyə də macal tapmadı.

Bu hörümçəklər tor hörmürlər, elə pusquda durduğu yerdən ovun üstünə atılırlar, buna görə də onları hoppanan hörümçək adlandırırlar. Onlar nə qədər iti görsələr də on santimetrdən uzağı görmürlər.

Budur, ilbiz sürünür. Bəs onun gözləri hanı? Başının ön hissəsində dörd çıxıntı var. Onlardan aşağıda yerləşən ikisi buynuzcuqdur, yuxarıdakıların üstündə isə gözləri yerləşir. Əgər yarpağa baxmaq lazımdırsa, ilbiz üst buynuzlarını azca əyib böyüdücü şüşə kimi görən gözləri ilə ona baxır. Onun gözləri çox sadədir, yalnız yaxını görür. Ancaq ilbizə lazım olan hər şeyi dərhal hiss edir. Əlini azca yaxınlaşdıran kimi ilbiz cəld buynuzlarını yığıb öz evciyinə çəkilir.

*Vitali Tanasiyçuk*





## GECƏ OVÇULARI

Sən nə vaxt daha yaxşı görürsən – gecə, yoxsa gündüz?

Əlbəttə, gündüz; axı gündüz günəş ətrafı işıqlandırır, hər tərəf aydın görünür.

Gecələr ay və ulduzların işığında insanlar zəif görürlər. Ancaq elə heyvanlar da var ki, gündüz yatır, gecələr isə ova çıxırlar.

Götürək elə pişiyi – məsələn, o, divanın üstündə uzanıb mürgüləyir. Yəqin ki, sən dəfələrlə onun yaşıl gözlərinə diqqətlə baxmısan və qaranlıqda onların işıq saçdığının şahidi olmusan. Görəsən, nə üçün?

Pişiyin gözünün dərinliyində güzgüyəbənzər gümüşü kristallar var. Bu "güzgü" gözə düşən işığı sanki gücləndirir. Buna görə də pişiklər gecələr zəif işıqda da yaxşı görürlər.

Ancaq gün işığı pişiyin gözləri üçün çox parlaqdır, odur ki, pişik özünü gün işığından qorumağa məcbur olur.

Günəşli gündə pişiyin gözlərinə diqqətlə baxsan görərsən ki, onun bəbəkləri kiçik yarıq kimi daralır. Bu yarıqlardan gözə işığın lap az hissəsi düşür. Pişik üçün bu kifayətdir, axı onun gözlərindəki "güzgülər" işığı gücləndirir. Gündüz pişik yarıq bəbəklərlə də yaxşı görür.

Gecələr isə pişiyin bəbəkləri böyüyür və yumrulaşır. O ən cüzi şüanı da özünə çəkir, göz "güzgüləri" isə öz vəzifəsini yerinə yetirir. Buna görə də pişiklər qaranlıqda da yaxşı görürlər.

Ancaq təkcə pişiklərin gözü belə deyil.

Bir dəfə mən cənubda, xaraba bir daxmada gecədən xeyli keçmiş iri gözləri olan qəribə bir kərtənkələyə rast gəldim. O qaranlıqda divarların üstü ilə qaçaraq milçək tuturdu. Bu hekkon idi.

Mən onun şəklini çəkməyi qərara aldım. Yavaş-yavaş yaxınlaşdım, ehtiyatla düyməni basdım – bir anda fotoaparatın ildırımı andıran gur işığı kərtənkələnin üstünə düşdü.

Bu nədir? İndicə mən hekkonun iri, yumru bəbəklərini aydın görürdüm, işıq yandıqdan sonra isə onun bəbəkləri qəribə xətlə haşiyələnmiş yarığa çevrildi.

Deməli, hekkonlar da eynən pişiklər kimi öz gözlərini gur işıqdan qoruyurlar! Axı onlar da gecə ova çıxan heyvanlardır.

Bəzi akulaların da göz bəbəkləri həmin qayda ilə dəyişir. Onlar daim yarımqaranlıq dərinliklərdə üzərkən bəbəkləri böyüyür, yumrulaşır. Ancaq akula suyun üzünə - işığa çıxanda isə onun bəbəkləri pişikdə və hekkonda olduğu kimi daralır.





## KİM BÜTÜN ƏTRAFI GÖRÜR?

Sən arxaya baxmaq üçün nə edirsən? Əlbəttə, geri dönürsən. İnsanlar, itlər və hətta ilanlar da belə edirlər. Bayquş isə bunun üçün geri dönmür – onun başı hər tərəfə asanlıqla dönür. Bayquşa hansı tərəfdən yaxınlaşırsan-yaxınlaş, o bədənini tərpətmədən üzünü sənə çevirəcək.

Bəs buqələmun ətrafına necə baxır? Buqələmun da kərtənkələnin qohumudur. Onların bir çox qeyri-adi xüsusiyyətləri hamını heyrətə gətirir. Bunlardan biri buqələmunun rəngini dəyişə bilməsidir. O yarpaqların arasında oturanda rəngi yaşıl olur, elə ki, sürünüb daşın üstünə çıxdı, daş kimi bomboz olur. Buqələmunun yapışqanlı və az qala onun özü boyda olan dili də çox qəribədir. Yaxın otlardan birinə cırcırama və ya kəpənək qonan kimi sanki buqələmunun dili güllə kimi açılır. Onun dilini ağzından çıxarmağı ilə ovun dilinə yapışması bir olur və bir göz qırpımında artıq ov onun ağzında olur.

Buqələmunun ən qəribə yeri gözləridir. Təkcə ona görə yox ki, onun gözləri dombadır və pulcuqlarla örtülüdür. Ən maraqlısı onların necə baxmalarıdır. İnsanların, heyvanların, quşların və kərtənkələlərin hər iki gözü daim eyni istiqamətə baxır – yəni gözün biri hara baxırsa, o biri də ora baxır. Buqələmununsa hər gözü bir tərəfə baxır. Onlardan biri aşağıya baxanda, o biri yana və ya arxaya baxır.

## BURUN VƏ DİL HAQQINDA

Katyanın iki gözü, iki qulağı, iki ayağı var, dili və burnu isə cəmi bircə dənədir.

Katya nənəsindən soruşur:

– Nənə, de görüm, nə üçün hər şey məndə iki dənədir, yalnız dilim və burnum təkdir?

Nənəsi cavab verir:

– Mənim sevimli nəvəm, sən çox görməli, eşitməli, işləməli, gəzməlisən, buna görə də gözün, qulağın, əlin və ayağın iki dənədir. Dilin və burnun ona görə bircə dənədir ki, az danışasan və burnunu hara gəldi soxmayasan.

İşə bir bax, sən demə, buna görə adamın bir burnu və bir dili olurmuş.

Aydın oldu?

*Yevgeni Permyak*

## SİÇANLAR NƏYƏ LAZIMDIR?

Mənim təzə salınmış bir bağım vardı. Baharda alma ağaclarına baş çəkmək üçün bağa getdim və gördüm ki, siçanlar ağacların kökünü elə gəmiriblər ki, hər ağacın dibində ağ yarıq əmələ gəlib. Almalar elə təzə-tər və yaxşı idilər ki... Hamısının budaqlarında tumurcuqlar görünürdü. Onlar çiçəkləyib bol meyvə verəcəkdilər, ancaq indi bilirdim ki, ağaclar məhv olacaqlar. Çünki insan qanı damarlarla hərəkət etdiyi kimi, ağac da öz kökləri ilə qidalanır. Mənim alma ağaclarına yazığım gəlirdi, kor-peşman bağdan qayıdıb dərdimi babama danışdım və dedim ki, əgər ixtiyarım olsaydı, yer üzündəki bütün siçanları məhv edərdim... Babam dedi:

– Heç bilirsən, sən siçanları məhv etsəydin, kimlər sənin yanına gəlib onların günahının bağışlanmasını xahiş edər?

Mən dedim:

– Onlar heç kimə lazım deyillər, heç kim onlara görə narahat olmaz.





Babam isə cavab verdi:

– Hamıdan əvvəl pişiklər gəlib onları əfv etməni xahiş edərdilər. Onlar deyərdilər: “Əgər sən siçanları məhv etsən, biz yeməyə heç nə tapmayacağıq”. Onlardan sonra tülkülər yanına minnətə gələrdilər. Onlar da deyərdilər: “Əgər siçanlar olmasa, biz toyuq-cücə oğurlamağa məcbur olacağıq”. Tülkülərdən sonra isə kəkliklər və tetralar da siçanları öldürməməyi xahiş edərdilər.

Mən təəccübləndim: axı siçanların qırılmağının kəkliklərə və tetralara nə dəxli var? Babam izah elədi:

– Siçanlar hamıdan çox onlara lazımdır. Onlar siçanları yemirlər, ancaq sən siçanları məhv etsən, tülkülər yeməyə heç nə tapa bilməyəcəklər, əlacsızlıqdan tetra və kəklik yuvalarına soxulacaqlar. Yaddan çıxarma ki, təbiətdə hər şey bir-birinə gərəkdir.

*Lev Tolstoy*

## QARIŞQALAR HAQQINDA

Bir dəfə mürəbbə gətirmək üçün anbara getmişdim. Bankanı əlimə aldıqda gördüm ki, mürəbbəni qarışqa basıb. Qarışqalar bankanın üstündə, mürəbbənin içində gəzirdilər. Mən qaşıqla bütün qarışqaları yığıb atdım, bankanı təmizlədim və yuxarı rəfə qoydum. Ertəsi gün yenə anbara gələndə gördüm ki, qarışqalar bu dəfə yuxarı rəfə dırmaşıb mürəbbənin içinə giriblər. Mən yenə bankanı götürüb təmizlədim, iplə bağlayıb tavandakı mıxdan asdım. Anbardan çıxanda dönüb bankaya baxdım və orada bir qarışqanın qaldığını gördüm. O bankanın üstündə gəzirdi. Mən onun bundan sonra nə edəcəyini bilmək üçün dayanıb diqqətlə qarışqanı izləməyə başladım. Qarışqa bankanın üstündə bir neçə dövrə vurandan sonra onun bağlandığı ipə tərəf qaçdı, sonra həmin ipin üstü ilə gedib tavana çatdı. Sonra tavanla gedib divara çatdı, divardan isə döşəmənin üstünə – bir dəstə qarışqanın yığıldığı yerə qaçdı. Görünür, bu qarışqa o birilərə hansı yolla bankadan gəldiyini nəql edirdi, çünki artıq qarışqaların çoxu onun qayıtdığı yolla bir-birinin ardınca divara tərəf qaçıb tavana dırmaşdılar, sonra ipin üstü ilə gedib mürəbbə bankasını tapdılar. Mən bankanı götürüb, yenə yerini dəyişdim.

*Lev Tolstoy*





# MƏZHƏKƏLƏR, LƏTİFƏLƏR, YUMORİSTİK ŞERLƏR VƏ YANILTMACLAR



## KİÇİK MƏZHƏKƏLƏR

Bir oğru birisinin paltarını oğurladı. Aparıb bir dəllala verdi ki, satsın. Elə oldu ki, paltarı ondan da oğurladılar. Oğru əliboş öz yoldaşlarının yanına qayıtdıqda ondan paltarı neçəyə satdığını soruşdular. O, cavab verib dedi ki, aldığım qiymətə satdım.

* * *

Gözləri çəp olan bir nəfərdən soruşdular:

– Doğrudurmu ki, deyirlər, çəp adam biri iki görər?

Qəzadan onun yanında bir xoruz bağlanmışdı. Çəp dedi:

– Yəqin ki, bu söz yalandır, əgər doğru olsaydı, onda mən bu iki xoruzu dörd görərdim.

* * *

Bir kişi bir kora dedi ki, deyirlər, Allah hər kəsi kor eləsə əvəzində ona yaxşı bir şey bağışlar. İndi de görək,



sənə nə bağışlayıbdır? Kor cavab verib dedi: "Bunu bağışlayıbdır ki, sənin kimilərinin üzünü görmürəm."

* * *

Oğru bir evə girdi, heç bir şey tapmadı ki, oğurlasın. Nəhayət, evin bir küncündə bir qədər yumşaq əhəng görüb zənn etdi ki, undur. Qurşağını açıb orada qoydu və getdi ki, unu gətirib qurşağına töksün. Ev yiyəsi bunu görüb qurşağı oğurladı. Oğru gördü ki, bu un deyil, əhəngdir. Geri qayıdanda gördü ki, qurşaq yoxdur. İstədi evdən çıxıb getsin. Ev yiyəsi qışqırıq qoparıb: "Oğrunu tutun!" – deyə bağırdı. Oğru isə dönüb ona dedi: "Oğrunun kim olduğu məlumdur!"

* * *

İki adam arasında belə bir söhbət oldu:

– Doğrudurmu ki, öləndən sonra hamı yenə diriləcəkdir?

– Bəli, doğrudur!

– Elə isə onda mənə yüz manat borc ver, o dünyada alarsan.

– Onda, sən də mənə zamin ver ki, bu şəkildə qiyamətə gələcəksən!

* * *

Bir it maralı qovurdu. Maral qaça-qaça itə dedi:

– Zəhmət çəkib özünü yorma, mənə çata bilməyəcəksən. Çünki mən canımın qorxusundan qaçıram, sən isə ağan üçün qaçırsan.

* * *

Bir gün bir qadın hakimin yanına gəlib ona nə qədər şikayət elədisə, hakim ona qulaq asmadı. Axırda qadın hakimə belə dedi:

– Ey hakim, bilirsənmi, padşah səni buraya nə üçün göndərmişdir?

– Xeyr, bilmirəm. De görək, nə üçün göndəribdir?
– O bilmək istəyir ki, bu vilayət hakimsiz dolana bilər, ya yox? Yoxsa səndən hakim olmaz.

* * *

Bir sahibkar öz xidmətçisinə dedi:
– İti ac saxlamaq lazımdır ki, öz sahibinə itaətli olsun.
– Belə olarsa, onda bir özgəsi bir parça çörək tulladıqda it onun dalınca gedər, – deyə xidmətçi cavab verdi.



Bir padşah müharibə etməyə gedirdi. Gördü ki, qoşun əhlindən bir nəfərin kamanı var, ancaq oxu yoxdur. Padşah ondan soruşdu:
– Nə üçün oxun yoxdur?
– Düşmən tərəfdən gələn oxları götürüb atacağam.
– Bəlkə onlar heç ox atmadılar?
– Onda demək, müharibə etməyə də ehtiyac yoxdur, – deyə cavab verdi.

*Mirzə Şəfi Vazeh*





**LƏTİFƏLƏR**

– Atacan, mənə tütək al!
– Yox, oğlum, sən tütəyi mənim qulağımın dibində çalıb işləməyə mane olarsan.
– Atacan, söz verirəm ki, yalnız sən yatanda çalaram.

* * *

Ata böyük oğluna üç alma verib dedi:
– Balaca qardaşınla qardaşcasına bölüşdür.
– Qardaşcasına, yəni necə?
– İkisini ona ver, birini özün götür. Adam nəyisə qardaşcasına böləndə həmişə özünə az götürər.
– Ata, olmaz ki, almaları qardaşıma verəsən, o qardaşcasına bölüşdürsün?

* * *

Yan otaqdan uşağın ağlamaq səsini eşidən ana çığırdı:
– Nə istəyir verin, sakit olsun.
Bir az sonra uşaq daha bərk qışqırdı. Ana yenə dedi:
– Dedim axı, nə istəyir verin.

Qulluqçu cavab verdi:
– Bal arısı istəyirdi, tutub vermişəm, sancıb.

* * *

Hirslənmiş ana böyük oğlundan soruşdu:
– Sən nə üçün kiçik qardaşının paxlavasını yemisən?
Uşaq halını pozmadan dedi:
– Məgər sən mənə deməmisən ki, gərək mən hər bir işdə qardaşıma kömək edim?

* * *

Balaca Məcidlə anası qatara mindilər. Biletlər yoxlanarkən məlum oldu ki, anası Məcidə bilet almayıb.
Ana dedi:
– Məcidin beş yaşı var.
Biletləri yoxlayan kişi üzünü Məcidə tutub soruşdu:
– Bala, neçə yaşın var?
– Beş il olar ki, vaqona minəndə yaşım beşdən artıq olmur.

* * *

Bir xanım iti ilə bulvara gəzməyə çıxmışdı. Dostu ondan soruşdu:
– Çox qəşəng itdir, ancaq yaman tüklüdür. Heç başı ilə quyruğunu ayırmaq olmur. Bəs siz necə bilirsiniz ki, başı hansıdır, quyruğu hansı?
– Bu çox asandır. Quyruğunu tuturam, əlimi dişləsə, bilirəm ki, başıdır.

* * *

– Uşaq iyirmi dörd pilləli bir nərdivandan yıxıldı, heç burnu da qanamadı.
– Ola bilməz!
– Niyə ola bilmir, axı o, birinci pillədən yıxılıb.



* * *

Bir balıq satılan dükanın qabağındakı lövhədə yazılmışdı: "Burada təzə balıq satılır".
Bir müştəri dedi:
– "Burada" sözü artıqdır. Hamı görür ki, balıqlar buradadır.
Balıqsatan o sözü pozdu.
İkinci müştəri dedi:
– "Satılır" sözü artıqdır. Hamı bilir ki, bu balıqlar satılmaq üçün buraya qoyulub.
Balıqçı o sözü də pozdu.
Üçüncü müştəri dedi:
– "Balıq" sözü artıqdır, çünki burada başqa şey yoxdu. Hamı görür ki, bu balıqdır.
Balıqçı o sözü də pozduqda lövhdə bircə "təzə" sözü qaldı. Onu da özü pozdu ki, mən heç vaxt köhnə balıq satmamışam.

* * *

Satıcı öz malını tərifləyərək deyirdi:
– Bu qələmi oda, suya atmaq, onunla vint bağlamaq, mıx vurmaq olar...
Alıcılardan biri soruşdu:
– Bağışlayın, onunla yazmaq da olarmı?

* * *

Birisi özünü tərifləyib deyirdi:
– Mənim gözüm olduqca yaxşı görür, məsələn, bu saat o minarənin başında uçan milçəyi görürəm.
Dostu ona belə cavab verdi:
– Mənim gözlərim pis görür, ancaq qulaqlarım yaxşı eşidir. Mən də sənin gördüyün milçəyin vızıltısını eşidirəm.

* * *

– Neçə yaşın var? – deyə qoca kəndlidən soruşdular.
– Altmış, ya yetmiş. Düzünü bilmirəm.

– Necə? Yaşını da bilmirsən?
– Bu mənim nəyimə lazımdır? Mən toyuqlarımı, qoyunlarımı, məhsulumu, pulumu sayıram, çünki onları oğurlaya bilərlər. Yaşımı isə heç kəs oğurlamaz.

* * *

İki yolçu bir-birilə söhbət edir.
Birincisi soruşdu:
– Ailəniz böyükdürmü?
– Bir oğlum var.
– Papiros çəkirmi?
– Yox.
– Restorana gedirmi?
– Heç vaxt.
– Axşamlar evə gec qayıdırmı?
– Yox.
– Əcəb qəribə oğlandır, onun neçə yaşı var?
– İki aylıqdır.

* * *

Biri yanındakı dostunu ətrafındakılara çox tərifləyir, axırda deyir:
– Onun müsbət cəhətləri olduqca çoxdur, yeganə nöqsanı hövsələsiz olmağı və tez özündən çıxmağıdır.
Dostu bunu eşidib əsəbi halda ona hücum edir və deyir:
– Əcəb qəribə adamsan, nə danışdığını bilirsən? Sən nə vaxt görmüsən ki, mən tez özümdən çıxım?
Qulaq asanlardan biri dedi:
– O, bəlkə, görməyib. Biz ki gördük.



## DÖRD YOLDAŞ

Dörd yoldaş dərədə gecələdilər,
Şirin bir yuxunu heç elədilər.
Kor dedi: – Uzaqdan qaraltı gəlir!
Kar dedi: – Bayaqdan taqqıltı gəlir!
Çılpaq qorxa-qorxa boylandı yola:
"Gecənin bu gecə vaxtı xeyir ola,
Qorxuram quldurlar tələ qurarlar,
Bircə köynəyim var, soyundurarlar!"
Çolaq çəliyini yerdən götürdü,
Doğrudan-doğruya qaraltı gördü.
Dedi: – Nəyə gərək boş nağıl açmaq?
Bircə əlac qalır – o da ki, qaçmaq!

*İlyas Tapdıq*

## YALQIZ QURBAĞA

– Qurbağa, hardan?
– Bulaqdan.
– Hardan keçdin?
– Yolaqdan.
– Cürdəyin hanı?
– Qırdılar.
Məni də beş-on vurdular.
– Sən ki topal deyildin,
Bir döymədin, döyüldün...
– Onlar iki, mən bir idim,
Onlar vurdu, mən kiridim.

*Məmməd Aslan*



**GOPÇU**

– O yana baxdım,
Bu yana baxdım.
Mindim sərçəni,
Lap göyə qalxdım.
Elə ki çatdım,
Ulduzu tutdum,
Dartdım, ha dartdım,
Yerə qayıtdım.
– Hanı bəs ulduz?
İnanmıram mən.
– Yerə çatanda
Çıxdı əlimdən.



– Mindim xoruza,
Getdim meşəyə.
Şir məni görüb
Döndü pişiyə;
Bərkdən çağırdım,
Dedim: "Şir hanı?"
Gördüm qorxudan
Çıxıbdır canı.



Çıxdım meşədən
Keçdim körpünü
İlanı gördüm
Yeyir kirpini.
Dovşanı gördüm
Udur dəvəni.
– Yaman gopçusan,
Tanıdım səni.

*Ağasəfa*



**XALIQ VƏ BALIQ**

Bir səhər gəzə-gəzə
Xalıq getdi dənizə.
Sevir balıq ovunu,
Tez atdı tilovunu.
Suya baxdıqca baxdı,
Çox balıq tutacaqdı.
Tilova düşdü balıq,
Sevindi-güldü Xalıq.
Xalıq dartdı balığı,
Balıq dartdı Xalığı,
Balıq dartdı,
Xalıq dartdı.
Xalıq dartdı,
Balıq dartdı.
İndi inandı Xalıq,
Yaman güclüdür balıq,
Gücü get-gedə artdı,
Xalığı yenə dartdı.
Tilovunun ipindən
Birdən bərk çəkdi Xalıq.
Bu vaxt çıxdı sahilə
Xalıq boyda bir balıq.

*Cavad Cavadlı*



**KOR VƏ KAR**

Kor kora
"Kor!" – dedi.
Kara kor
"Gör!", – dedi.
Kor ata
Kar mindi?
Kar ata
Kor mindi?

**SAAT**

Saatsaz
Saatı
Sazlayıb
Saxladı.
Saatdan-saata
Saatı
Saatla
Yoxladı.

*Simax Şeyda*

## MÜNDƏRİCAT

### DOĞMA MƏKTƏB QOYNUNDA


Məktəb. *İlyas Tapdıq* ..... 4
Xoşbəxtlik. *Alxas Alxasov* ..... 5
Zəhra üçün. *Mikayıl Müşfiq* ..... 6
Qonşular. *Tofiq İsmayılov* ..... 7
Valideynlərə. *İlyas Tapdıq* ..... 8
Göy yarpaqlar. *Valentina Oseyeva* ..... 9
Ata və oğul. *Abbas Səhhət* ..... 10
Nənəm məktəblidir. *Xalidə Hasilova* ..... 11
Çinar və gilənar. *Əli Kərim* ..... 12
Meşəsalanlar. *Alxas Alxasov* ..... 13
Dəyərli məsləhət ..... 14


### VƏTƏNİM


Azərbaycan – yurdum mənim. *Məmməd Araz* ..... 16
Vətən nədir? *Qaçay Köçərli* ..... 17
Kür boyunda. *Gəray Fəzli* ..... 19
Bulaq. *Hüseyn Arif* ..... 20
Ölkəmin çiçəkləri. *Mikayıl Rzaquluzadə* ..... 20
Torpaq anadır, zəhmət ata. *Rafiq Yusifoğlu* ..... 21
Azərbaycan. *Hikmət Ziya* ..... 22
Bayrağım. *Azərbaycanlı, "Məktəb" jurnalı 21, 1920* ..... 22
Bayrağım. *Fikrət Sadıq* ..... 24
Yurdumuza arxayıq. *Zeynal Cabbarzadə* ..... 24
Məktəbdə. *Müəllim Cəfər, "Məktəb" jurnalı 3, 1911* ..... 25
Naxçıvan. *Bayram Ələsgərov* ..... 26
Gəncə ..... 27
Göygöl *Bayram Ələsgərov* ..... 27
Göygöl. *Məmməd Araz* ..... 28
Bakı. *Bayram Ələsgərov* ..... 29
Bakı. *İlyas Tapdıq* ..... 30
Bakı metrosu. *Hikmət Ziya* ..... 30
Danış, Xəzərim, danış... *Fikrət Qoca* ..... 31
Qız Qalası. *Fikrət Sadıq* ..... 32





Sabah şənbə idi... *Bəxtiyar Vahabzadə* ..... 33
Bir parça torpaq. *Əli Səmədli* ..... 34
Qarabağ. *Ələmdar Quluzadə* ..... 37
Azərbaycanın Milli Qəhrəmanı Aytəkin Məmmədov. *Oqtay Hüseynli* ..... 38
Dağlar *(bayatılar)* ..... 40
Salatın. *Oqtay Rza* ..... 41
İtirilmiş açar. *Əli Smədli* ..... 42
Anacan, işığı kim söndürüb? *Qaçay Köçərli* ..... 45
Qəhrəman Cingiz. *Oqtay Rza* ..... 53
Ürək xatirəsi. *Rüfət Zəbioğlu* ..... 54


### İLLƏR ƏBƏS ÖTMƏSİN


Qoşa söyüd. *Xalidə Hasilova* ..... 56
İllər əbəs ötməsin. *Bəxtiyar Vahabzadə* ..... 58
Yenə dağlardan tütək səsi gəlir. *Əlaviyyə Babayeva* ..... 58
Dəmirçi. *İlyas Tapdıq* ..... 64
Yaxşı iş. *Valentina Oseyeva* ..... 65
Uçan çıraqlar. *Zahid Xəlil* ..... 66
Çörək. *Fikrət Sadıq* ..... 66
Quşların mənfəəti. *Rəşidbəy Əfəndiyev* ..... 67
İpək paltar. *Məmməd Aslan* ..... 68
Yoldaşlıq köməyi. *Mehdi Seyidzadə* ..... 68
Oğullar. *Valentina Oseyeva* ..... 69
Bağlar. *Rəsul Rza* ..... 70
Quru çörək. *Ağaddin Mansurzadə* ..... 71
Yanğın iti. *Lev Tolstoy* ..... 72


### ÖMRÜMÜZLƏ İŞIQ SALAQ


Gülsabah. *Süleyman Rəhimov* ..... 74
Heç nə istəməyən qız. *Nəriman Həsənzadə* ..... 75
Ulduz sərvəti. *Cingiz Əlioğlu* ..... 75
Hıçqırıq. *Əjdər Ağayev* ..... 76
Qonaq gəlsə... *Ələsgər Əlioğlu* ..... 77
Qızılgül. *Hacağa Cümşüdlü* ..... 78
Ata. *Musa Ələkbərli* ..... 81

Qoca bənna. *Mehdi Seyidzadə* 81
Səmirə və sarıçiçək. *Bayram İsgəndərov* 82
Çəmən. *Zahid Xəlil* 83
Usta-şagird. *Süleyman Rəhimov* 84
İpəkqurdu. *Əlfi Qasımov* 85
Yeddi çinar. *Rəsul Rza* 86

BƏXTƏVƏR UŞAQLAR

Özünü itirmədi. *Xalidə Hasilova* 88
Əllərimdə nələr var. *Məmməd Namaz* 90
Yelləncək. *Çingiz Sultanov* 91
Heç özü də bilmir... *Fuad Tarverdiyev* 94
Velosiped. *Çingiz Sultanov* 96
Almazın xəstələnməsi əhvalatı. *Çingiz Sultanov* 97
Günah məstanda imiş. *Ələviyyə Babayeva* 97
Hansı asandır? *Valentina Oseyeva* 99
İntiqam aldı. *Valentina Oseyeva* 100
Xatirə. *Əjdər Ağayev* 101
Mən də oynamaq istəyirəm. *Həbibə Zeynalova* 102
Peşmançılıq. *Şəfiqə Ağayeva* 104
Tay çəkmə. *Hacıağa Cümşüdlü* 105
Qırmızı almalar. *Əlibala Hacızadə* 107
Hədiyyə. *Hüseyn Nəcəfov* 109
Onsuz da... *Əlibala Hacızadə* 111
Pəhləvan. *Əlibala Hacızadə* 113
Nənəm nağıl danışır. *Nəbi Xəzri* 116

İLİN FƏSİLLƏRİ

Fəsillər. *Rəşidbəy Əfəndiyev* 118
Yaz (N. Gəncəvidən). *İşləyəni Mir Cəlal* 119
İlk bahar çağı. *Nizami Gəncəvi* 120
Bahar gəlir. *Yusif Həsənbəy* 121
Qoz ağacı. *Bayram İsgəndərov* 122
Bu yaz. *Ələsgər Əlioğlu* 123
Bahar yeridi. *Ələsgər Əlioğlu* 123
Səhər-səhər. *Əhməd Cəmil* 124



Balaca qırmızı çiçək. *Elçin* 124
Heydərbabaya salam (poemadan parçalar). *Məhəmmədhüseyn Şəhriyar* 127
Bahar. *Abdulla Şaiq* 128
Calaq. *Cavad Zeynal* 128
Qaranquş. *Teymur Elçin* 130
Küləyin, çinarın və qaranquş balasının hekayəti. *Elçin* 130
Novruz bayramı. *Azad Nəbiyev* 133
"Elə ki, fəsil-yaz olur" *Abbas Səhhət* 133
Su çərşənbəsi. *Azad Nəbiyev* 134
Od çərşənbəsi. *Azad Nəbiyev* 135
Yel çərşənbəsi. *Azad Nəbiyev* 136
Torpaq çərşənbəsi. *Azad Nəbiyev* 137
Yüz yaşında bağban. *Rəşidbəy Əfəndiyev* 138
Ağ çiçək. *Münəvvər Tapdıqova* 139
Yay (N. Gəncəvidən) *İşləyəni Mir Cəlal* 140
Yayın təsviri. *Nizami Gəncəvi* 141
Çiyələk. *İlyas Tapdıq* 142
Bir səbət üzüm. *Hacı Ağayev* 143
Alma ağacı. *Məmməd Aslan* 144
Payız (N. Gəncəvidən). *İşləyəni Mir Cəlal* 145
Payız. *Abdulla Şaiq* 146
Son bahar. *Rafiq Yusifoğlu* 146
Payız yetişəndə *Nizami Gəncəvi* 147
Ov. *Konstantin Uşinski* 148
Şabalıd payı. *Münəvvər Tapdıqova* 149
Köçəri quşlar. *Əli Həkim* 153
Ovçu babanın söhbəti. *Ələviyyə Babayeva* 154
Qışa az qalıb. *Hüseyn Abbaszadə* 155
Qış (N. Gəncəvidən) *İşləyəni Mir Cəlal* 156
Qış gələndə. *Nizami Gəncəvi* 157
Qışın Nəğməsi. *Abdulla Şaiq* 158
Üç qarğa. *Valentina Oseyeva* 159
Torağay. *Mirvarid Dilbazi* 160
Qış tətilində. *Şamistan Əsgərov* 160

Qış. *Məmməd İsmayıl* 165
Qar. *Məmməd Faiq* 165
Kəndli ilə qışın dostluğu. *Əli Səmədli* 166
İlk qar. *Rafiq Yusifoğlu* 169
Qış da gözəldir. *Azad Talışoğlu* 169
Qar dənəsinin sərgüzəşti. *Səməd Bəhrəngi* 170
Qış. *Çingiz Əlioğlu* 172
Zərifə. *Tofiq Mahmud* 173
Bu bulud. *Zülfüqar Şahsevənli* 173
Qış deyir. *Nigar Rəfibəyli* 174

NAĞILLAR ALƏMİNƏ SƏYAHƏT

Şir və tülkü. *Süleyman Rəhimov* 176
Şir və siçan. *Lev Tolstoy* 179
At və eşşək. *Konstantin Uşinski* 179
Ədalətli padşah. *Rəşidbəy Əfəndiyev* 180
Bülbül və leylək. *Əjdər Ağayev* 180
Güzgü. *Zahid Xəlil* 182
Tutuquşu. *Hacı Ağayev* 183
Hind nağılı. 184
Bir dovşan iki tülkünü necə aldatdı? *Əli Səmədli* 185
Çörək. *Əzizə Cəfərzadə* 187
Qarı və pişik. 190
Yumurta əhvalatı. *Əzizə Cəfərzadə* 192
Tülkü və canavar 195

BUNLARI BİLMƏK MARAQLIDIR

Nə üçün su ilə yuyunurlar? *M. İlin* 198
Nə üçün döşəmənin üstündə könki ilə sürüşmək olmur? 198
Kibrit nə üçün yanır? 199
Nə üçün su alovu söndürür? 200
Kartof nədir? 200
Nə üçün kartofu çiy yemirlər? 201
Nə üçün qızardılmış kartofun üstü bərk, qaynadılmış kartofunku isə yumşaq olur? 201



Nə üçün çörək quruyur? 202
Nə üçün nişastalanmış paltar bərk olur? 202
Nə üçün çörəyin qabığı olur? 202
Şorba nədir? 203
Biz əti nə üçün yeyirik? 204
Süd nə üçün turşuyur? 205
Pendirdə nə üçün deşiklər olur? 205
Pendir nə üçün uzun müddət xarab olmur? 206
Ən möhkəm və ən davamsız material nədir? 206
Biz alt paltarını nə üçün geyirik? *M. İlin* 207
Ağ dovşan. *Gennadi Snigiryov* 207
Ussuriya pələngi. *Gennadi Snigiryov* 208
Kambala. 209
Yalnız yaxından görənlər kimlərdir. *Vitali Tanasiyçuk* 210
Gecə ovçuları. 211
Kim bütün ətrafı görür? 213
Burun və dil haqqında. *Yevgeni Permyak* 214
Siçanlar nəyə lazımdır? *Lev Tolstoy* 214
Qarışqalar haqqında. *Lev Tolstoy* 216

MƏZHƏKƏLƏR, LƏTİFƏLƏR, YUMORİSTİK ŞERLƏR VƏ YANILTMACLAR

Kiçik məzhəkələr. *Mirzə Şəfi Vazeh* 218
Lətifələr. 221
Dörd yoldaş. *İlyas Tapdıq* 225
Yalqız qurbağa. *Məmməd Aslan* 225
Gopçu. *Ağasəfa* 226
Xalıq və balıq. *Cavad Cavadlı* 227
Kor və kar. 227
Saat. *Simax Şeyda* 227

*Direktor:* Oqtay Hüseynli
*Redaktor:* Fatma Hüseynova
*Bədii redaktor:* Rəhilə Məmmədova
*Korrektor:* Aqil Fərmanoğlu
*Dizayner:* Azər Sadıqbəyli
*Mətni yığdı:* Qala Naumova

Yığılmağa verilmiş 21. 09. 2001. Çapa imzalanmış 01. 12. 2002.
Kağız formatı 70x100 $^1/_{16}$. Ofset çapı. Fiziki ç. v. 14,75. Rəngli şərti ç. v. 275,6.
Tirajı 5000. Sifariş 40. Qiyməti müqavilə ilə.
Kitab "Turan" nəşrlər evində hazırlanıb çap edilmişdir. Bakı, Şərifzadə küç. 3.
Lisenziya № 022066.
Kitabın topdan satışı ilə bağlı aşağıdakı telefona müraciət
edə bilərsiniz: 32-11-48

